**Серебряков И.Г.** (1964) Жизненные формы высших растений и их изучение. В кн.: Полевая геоботаника. М.: АН СССР, **3:** 146-205.

**Серебряков И.Г.** (1995) Основные направления эволюции жизненных форм у покрытосеменных растений. Бюлл. Моск. общ-ва. испыт. природы, отд. Биолог. **10(3):** 71- 91.

**Сухоруков А.П. и Акопян Ж.А.** (2013) Конспект семейства *Chenopodiaceae* Кавказа. М.: МАКС Пресс, 76 с.

**Тахтаджян А.Т.** (отв. ред.) (2008) Конспект флоры Кавказа, т. 3 (1). М.: КМК Пресс, 469 с.

**Черепанов С.К.** (1995) Сосудистые растения России и сопредельных государств. СПб.: Мир и семья-95, 990 с.

**Шенников А.П.** (1964) Введение в геоботанику. Л.: Изд-во Ленинград. ун-та, 447 с.

**Ярошенко Д.В.** (1969) Геоботаника. М.: Просвещение, 200 с.

**Mövsümova F.Q.** (2007 в) Azərbaycan florasının (*Chenopodiaceae*) yeni taksonları. AMEA Məruzələri **32(1),** 59-62.

**Gadjiev V.D. and Movsumova F.G.** (2002) Taxonomic revision of *Chenopodiaceae* family of Azerbaijan. VIth plant Life of southwest Asia Symposium. Yüzncü yıl Yniversity, Van-Turkey, p.69.

**Raunkiær Ch.** (1937) Plant life forms. Oxford: Clarendon Press, 104 p.

www.derev-grad.ru/ekologiya/ekologicheskie-gruppy-vidov-rastenii.html

## Abşeron Florasında C*henopodiaceae Vent.* Fəsiləsinin Taksonomik Tərkibi və Onun Ekoloji Analizi

**F.Q. Mövsümova, H.Q. Babayev, M.H. Zeynalova, Y.M. Feyziyev**

*AMEA Botanika Institutu*

Məqalədə Azərbaycanın Abşeron yarımadası ərazisinin quraqlıq və yarım-quraqlıq zonalarında *Chenopodiaceae* Vent. fəsiləsindən olan növlərin paylanması və ekoloji-fitosenotik xarakteristikası verilmişdir. Bu ailənin nümayəndələrinin ekoloji məhdudiyyəti və praktiki əhəmiyyəti identifikasiya edilmiş, onların həyat formaları işıq, su və torpaqdan asılı olaraq təsnif edilmişdir.

***Açar sözlər:*** *Chenopodiaceae, fitosenoz, flora, biomorf*

## Taxonomic Composition of C*henopodiaceae* Vent. Family in Absheron Flora and Its Ecological Analysis

**F.G. Movsumova, H.G. Babayev, M.H. Zeynalova, Y.M. Feyziyev**

*Institute of Botany, ANAS*

The paper presents new data on the distribution of species of *Chenopodiaceae* Vent. family and its ecologo-phytocenotical characteristics in arid and semi-arid areas of the Absheron peninsula territory of Azerbaijan. Ecological confinement and practical significance of representatives of *Chenopodiaceae* have been identified and their life forms have been classified with respect to light, water and soil.

***Key words:*** *Chenopodiaceae, phytocenosis, flora, biomorph*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 36-43(2014)*

# Azərbaycan Florasında *Anthemideae* Cass. (fəs. *Asteraceae* Bercht. et J.Presl) Tribasının Təftişi

**S.C. Mustafayeva**

*AMEA Botanika İnstitutu, Badamdar şossesi, 40, Bakı AZ1073, Azərbaycan;*
*E-mail: msitara@mail.ru*

**Məqalə Azərbaycan florasında *Anthemideae* tribasının cins və növlərinin taksonomik tərkibinin müqayisəli təhlilinə həsr olunmuşdur. Aparılan tədqiqatlardan məlum olmuşdur ki, Azərbaycan florasında *Anthemideae* tribası 10 cinsdə cəmlənən 108 növlə təmsil olunur.**

***Açar sözlər:*** *Asteraceae, Anthemideae, triba, cins, növ, taksonomiya*

## GİRİŞ

Tədqiqat Asteraceae Bercht. Et J.Presl – Astrakimilər fəsiləsinin Asteroideae yarımfəsiləsinə aid ən böyük triba olan Anthemideae Cass. – Çobanyastığıkimilərin öyrənilməsinə həsr edilmişdir. Triba 14 yarımtribaya bölünməklə, 1800 növü özündə cəmləşdirən 111 cinslə yer kürəsində təmsil olunur. Həyati formalarına görə tribaya - otlar, yarımkolcuqlar, yarımkollar və kollar daxildir (Oberprieler et al., 2007). Növləri əsasən Aralıq dənizi, Cənubi Afrika, Avropa, Asiyada, həmçinin bəzi nümayəndələri Amerika, Avstraliya və Yeni Zelandiyada yayılmışlar (Флора СССР, 1961).

## MATERIAL VƏ METODLAR

Tədqiqat işi 2008-2014-cü illəri əhatə edir. Azərbaycan florasında tribaya daxil olan növlərin araşdırılması çöl marşrutları (Полевая геобо-таника, 1964), ekspedisiyalar, stasionar, laborator və kameral şəraitlərdə aparılmış və 350 ədəd herbari nümunələri toplanmışdır. AMEA Botanika İnstitutunun Mərkəzi Herbariumu təftiş edilmiş və toplanan materiallar "Флора Азербайджана" (1961); "Конспект флоры Кавказа" (2008) və A.M.Əsgərovun Azərbaycanın ali bitkiləri (Lamiaceae, Asteraceae) (2008) və Azərbaycan florasının konspekti (2011) əsərləri ilə müqayisəli öyrənilmişdir. Növlərin adlandırılması son nomenklaturaya görə dəqiqləşdirilmişdir (Черепанов, 1995).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Aparılmış tədqiqatlara əsasən, müəyyən olunmuşdur ki, Azərbaycan florasında Anthemideae tribasının taksonomik tərkibinin sərhədləri tam məlum deyilmiş. Son nomenklaturaya əsasən bəzi cinslərin adı dəyişmiş, cinslər daxilindən yeni cinslər ayrılmış, bəzi cinslər tamamilə çıxardılmışdır (cədvəl 1).

Beləliklə, cədvəl 1-dən göründüyü kimi, monotip *Anacyclus* və *Leucanthemum* cinsləri istrisna olmaqla, bütün cinslərin sistematik tərkibində dəyişikliklər olmuşdur. *Anthemis* cinsinin növ tərkibi 12-16 növ, *Achillea* - 9-13, *Matricaria* - 1-3, *Pyrethrum* - 17-28, *Tanacetum* - 4-25, *Tripleurospermum* - 6-8 növ arasında dəyişmişdir. S.K.Çerepanova (Черепанов, 1995) görə *Matricaria* cinsindən yeni *Lepidotheca*, *Achillea* cinsindən yeni *Ptarmica* cinsi ayrılmış, "Флора СССР"-ə görə *Chamaemelum* cinsi *Tripleurospermum* adlandırılmış, "Конспект флоры Кавказа" (Конспект флоры Кавказа, 2008) və A.M.Əsgərovun "Azərbaycan florasının konspekti" (Əsgərov, 2011) əsərlərinə görə isə *Ptarmica* cinsi yenidən *Achillea* cinsinə, *Pyrethrum* cinsi bütövlükdə *Tanacetum* cinsinin tərkibinə keçmişdir.

Azərbaycanın florasında *Artemisia* cinsi növlərini son 30 ilə yaxın bir dövrdə hərtərəfli öyrənən AMEA Botanika İnstitutunun aparıcı elmi işçisi, b.e.n. A.N. Ələsgərova hazırda florada yovşanların 42 növ və variasiyalarının yayıldığını öz doktorluq mövzusunu işləyərək təsdiqləmişdir. Cinsin "Флора Азербайджана" kitabında 17 növünün olduğu göstərilmişdir (Флора Азербайджана, 1961). Qeyd etmək lazımdır ki, A.N.Ələsgərova ondan öncə, tam təsdiqlənməsə də, R. Y. Rzazadə tərəfindən (Рзазаде, 1955) Azərbaycan florasından toplanılmış və AMEA Botanika İnstitutunun Mərkəzi Herbari fondunda, eləcə də tiplərinin Rusiya (Sankt-Peterburq) Botanika İnstitutunda indiyədək saxlanılan 42 növün yayılmasını apardığı xemotaksonomik tədqiqatlarla sübuta yetirmişdir (Ələsgərova, İbadullayeva, 2011; Ələsgərova, 2012).

**Cədvəl 1.** Azərbaycan florasında *Anthemideae* tribasının cins və növləri (ədəbiyyat məlumatlarına görə)

| Cinslər | | **"Флора Азербайджана" görə** | | **"Флора СССР"-ə görə** | | **S.K. Çerepanova görə** | | **"Конспект флоры Кавказа" görə** | | **A.M. Əsgərov "Azərbaycan florasının konspekti"-nə görə** | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | **növlərin sayı** | **ümumi saya nisbətən %-i** | **növlərin sayı** | **ümumi saya nisbə-tən %-i** | **növlərin sayı** | **ümumi saya nisbə-tən %-i** | **növlərin sayı** | **ümumi saya nisbə-tən %-i** | **növlərin sayı** | **ümumi saya nisbətən %-i** |
| 1. | *Anacyclus* L. | 1 | 1,1 | 1 | 1,2 | 1 | 1,2 | 1 | 1,2 | 1 | 1,2 |
| 2. | *Anthemis* L. | 16 | 17,4 | 15 | 18,1 | 14 | 16,7 | 12 | 19,3 | 16 | 18,6 |
| 3. | *Achillea* L. | 13 | 14,1 | 12 | 14,5 | 9 | 10,7 | 12 | 14,5 | 12 | 14,0 |
| 4. | *Artemisia* L. | 17 | 18,5 | 17 | 20,5 | 16 | 19,1 | 19 | 22,9 | 19 | 22,1 |
| 5. | *Matricaria* L. | 2 | 2,2 | 3 | 3,6 | 1 | 1,2 | 3 | 3,6 | 3 | 3,5 |
| 6. | *Leucanthemum* Hill. | 1 | 1,1 | 1 | 1,2 | 1 | 1,2 | 1 | 1,2 | 1 | 1,2 |
| 7. | *Lepidotheca* Nutt. | - | - | - | - | 1 | 1,2 | - | - | - | - |
| 8. | *Chamaemelum* Mill. | 9 | 9,8 | - | - | - | - | - | - | - | |
| 9. | *Chrysanthemum* L. | 1 | 1,1 | - | - | 2 | 2,4 | - | - | 2 | 2,3 |
| 10. | *Pyrethrum* Zinn. | 28 | 30,4 | 17 | 20,5 | 19 | 22,6 | - | - | - | - |
| 11. | *Ptarmica* Hill. | - | - | | - | 3 | 3,6 | - | - | - | - |
| 12. | *Tanacetum* L. | 4 | 4,4 | 10 | 12,1 | 9 | 10,7 | 25 | 30,1 | 25 | 29,1 |
| 13 | *Tripleurospermum* Sch.Bip. | - | - | 7 | 8,4 | 8 | 9,5 | 6 | 7,2 | 7 | 8,1 |
| | Cəmi | 92 | 100 | 83 | 100 | 84 | 100 | 83 | 100 | 86 | 100 |

Bundan başqa, son nomenklaturada (Черепанов, 1995) həmçinin, *Anthemideae* tribasının bir çox növlərinin adı dəyişmişdir (cədvəl 2). Cədvəl 2-dən göründüyü kimi, Azərbaycan florasında (1961) 16 növlə təmsil olunan *Anthemis* cinsində aşağıdakı dəyişikliklər olmuşdur: "Флора СССР"-ə (1961) görə növ sırasına yeni *A. talyschensis* və *A. coelopoda* növləri əlavə edilmiş, *Anthemis zangelana* və *A. hyrcana* növləri morfoloji əlamətlərinə görə oxşar olduqları üçün birləşdirilərək *A. auctriaca; A. rudolphiana* isə *A. sosnovskyana* adlandırılmışlar. S.K.Çerepanova (1995) görə *A. grossheimii* növünün adı sinonimi və ilk adı olan *A. hausshnechtii* ilə əvəz edilmişdir. "Конспект флоры Кавказа" (2008) görə *A. iberica* ilk adı olan *A. cretica* növünün yarımnövü kimi təqdim olunmuşdur - *A.cretica subsp. iberica* (Bieb.) Grierson; *A. rigescens, A. dumetorum, A. talyschensis A. sachokiana* növləri birləşdirilərək *A. triumfettii* adlandırılmışdır. A.M.Əsgərovun "Azərbaycan florasının konspekti"nə (2011) görə *Anthemis* cinsinin Azərbaycanda 16 növü yayılmışdır. Belə ki, *A.dumetorum* və *A. woronovii*, həmçinin *A. karabaghensis* və *A. hausshnechtii* sərbəst növlər kimi saxlanılmışdır. Biz isə apardığımız araşdırmalara görə müəyyən etmişik ki, *Anthemis* cinsi hal-hazırda floramızda 14 növlə təmsil olunur: *A.altissima*, *A.auctriaca, A.candidissima, A. cotula, A. dumetorum, A. fruticulosa, A. iberica, A.karabaghensis, A. tinctoria, A. triumfettii, A. sosnovskyana, A.melanoloma, A. ruthenica, A.woronowii. A.altissima* və *A. coelopoda* sinonim növlər olduguna görə biz növü *A.altissima*, eləcə də *A. karabaghensis* və *A. hausshnechtii* sinonim növlər olduguna görə biz növü *A. karabaghensis* adı ilə saxlamağı məqsədəuyğun sayırıq.

Azərbaycan florasında 13 növlə təmsil olunan *Achillea* cinsinin tərkibində də (Флора Азербайджана, 1961) bir sıra dəyişikliklər olmuşdur. Apardığımız (1983-1989-cu illər) *Achillea* cinsi növlərinin bioekoloji xüsusiyyətləri və efiryağlılığına həsr olunmuş tədqiqat işində Azərbaycan ərazisində bu cinsin 13 deyil, 14 növünün olduğu müəyyən edilmişdir (Mustafayeva, 1989). Yeni müəyyən olunmuş növ *A.nabelekii* Heimerl. – nabeleki boymadərəni növüdür. Bu növün Azərbaycanda olması vaxtı ilə A.A. Qrossheym (1949) və İ.P.Mandenovanın (Флора Грузии, 1952) qeyd etdikləri kimi, Kürdüstandan təsvir olunmuş nabeleki boymadərəni növünün Talış və Qarabağda yayılması fikrini təsdiqləyir. Biz bu növü Abşeronun Novxanı qəsəbəsindən təsvir etmişik. Bu ərazi *A.nabelekii* üçün yeni yayılma sahəsidir. Bundan başqa, "Флора СССР"-ə görə (1961) *A.santolina* növü *A. wilhelmsii* adlandırılmışdır. Daha sonra S.K.Çerepanova (1995) görə *Achillea* cinsinin 3 növü *A.biserrata, A. ptarmicifolia, A.sachokiana Ptarmica* cinsinə keçmişdir.

"Конспект флоры Кавказа" (2008) və A.M.Əsgərovun "Azərbaycan florasının konspekti"-nə (2011) görə isə *Ptarmica* cins kimi çıxardılmış, onun növləri yenidən *Achillea* cinsinin

tərkibində olan *Ptarmica* seksiyasına salınmış və ümumi olaraq cinsin dəyişiklikləri belə olmuşdur: *A.setacea* növü *A. millefolium*-a, *A.sachokiana* isə *A.ptarmicifolia* növünə birləşdirilmişdir. *A.neilrechii* isə Azərbaycan florasına gəlmiş yeni növdür və o, dilcikşəkilli çiçəklərinin sarı rəngli, eləcə də toxumcalarının bir qədər iri olması ilə *A.nobilis* növündən fərqlənir.

**Cədvəl 2.** Azərbaycan florasında *Anthemideae* tribası növlərinin ədəbiyyat məlumatlarına görə konspekti

| **“Флора Азербайджана” görə** | **“Флора СССР” görə** | **С.К.Черепанова görə** | **“Конспект флоры Кавказа” görə** | **A.M.Əsgərov “Azərbaycan florasının konspekti”-nə görə** |
|---|---|---|---|---|
| 1 | 2 | 3 | 4 | 5 |
| **_Anacyclus_ L.** | **_Anacyclus_ L.** | **_Anacyclus_ L.** | **_Anacyclus_ L.** | **_Anacyclus_ L.** |
| *A.ciliatus* Trautv. | *ciliatus* Trautv. | *ciliatus* Trautv. | ○*ciliatus* Trautv. | *ciliatus* Trautv. |
| **_Anthemis_ L.** | **_Anthemis_ L.** | **_Anthemis_ L.** | **_Anthemis_ L.** | **_Anthemis_ L.** |
| *altissima* L. | *altissima* L. | *altissima* L. | *altissima* L. | *altissima* L. |
| *candidissima* Willd. ex | *auctriaca* Jacq. | *auctriaca* Jacq. | *auctriaca* Jacq. | *auctriaca* Jacq. |
| Spr. | *candidissima* Willd. ex | *candidissima* Willd. ex | *candidissima* Willd. ex | *candidissima* Willd. ex |
| *cotula* L. | Spreng. | Spreng. | Spreng. *cotula* L. | Spreng. |
| *dumetorum* D.Sosn. | *coelopoda* Boiss. | *coelopoda* Boiss. | ○*fruticulosa* Bieb. | *coelopoda* Boiss. |
| ○*fruticulosa* M.B. | *cotula* L. | *cotula* L. | *hausshnechtii* Boiss. et | *cotula* L. |
| *grossheimii* D.Sosn. | *dumetorum* Sosn. | *dumetorum* Sosn. | Reut. | *dumetorum* Sosn. |
| *hyrcana* D.Sosn. | ○*fruticulosa* M.B. | ○*fruticulosa Bieb.* | ○*cretica* subsp. *iberica* | ○*fruticulosa* Bieb. |
| *iberica* M.B. | *grossheimii* Sosn. | *hausshnechtii* Boiss | (Bieb.) Grierson | *hausshnechtii* Boiss. et |
| *melanoloma* Trautv. | *iberica* M.B. | et Reut. | *melanoloma* Trautv. | Reut. |
| *rigescens* Willd. | *melanoloma* Trautv. | *iberica* Bieb. | *ruthenica* Bieb. | *iberica* Bieb. |
| *rudolphiana* Ad. | *rigescens* Willd. | *melanoloma* Trautv. | *tinctoria* L. | *karabaghensis* Mikheev |
| *ruthenica* M.B. | *ruthenica* M.B. | *rigescens* Willd. | *triumfettii* (L.) All. | *melanoloma* Trautv. |
| ●*sachokiana* | *talyschensis* Fed. | *ruthenica* Bieb. | ○*sosnovskyana* Fed. | *ruthenica* Bieb. |
| D.Sosn. | *tinctoria* L. | *tinctoria* L. | **_Achillea_ L.** | *tinctoria* L. |
| *tinctoria* L. | *woronowii* Sosn. | *woronowii* Sosn. | *bieberşteinii* Afan. | *triumfettii* (L.) All. |
| *woronowii* D.Sosn. | **_Achillea_ L.** | **_Achillea_ L.** | ○*biserrata* Bieb. | *sosnovskyana* Fed. |
| *zangelana* D.Sosn. | *bieberşteinii* Afan. | *bieberşteinii* Afan. | *cuneatiloba* Boiss. et | *woronowii* Sosn. |
| **_Achillea_ L.** | ○*biserrata* M.B. | *cuneatiloba* Boiss. et | Buhse | **_Achillea_ L.** |
| *bieberşteinii* Afan. | *cuneatiloba* Boiss. et | Buhse | *filipendulina* Lam. | *bieberşteinii* Afan. |
| ○*biserrata* M.B. | Buhse | *filipendulina* Lam. | *grandiflora* Bieb. | *biserrata* Bieb. |
| *cuneatiloba* Boiss. et | *filipendulina* Lam. | *millefolium* L. | *millefolium* L. | *cuneatiloba* Boiss. |
| Buhse | *millefolium* L. | *nobilis* L. | *neilrechii* A.Kern. | et Buhse |
| *filipendulina* Lam. | *nobilis* L. | *setacea* Waldst. et Kit. | *nobilis* L. | *filipendulina* Lam. |
| *grandiflora* M.B. | *ptarmicifolia* | *tenuifolia* Lam. | ○*ptarmicifolia* (Willd.) | *grandiflora* Bieb. |
| *millefolium* L. | (Willd.) Rupr. ex | *vermicularis* Trin. | Rupr. ex Heimerl. | *millefolium* L. |
| *nobilis* L. | Heimerl. | *wilhelmsii* C.Koch | *tenuifolia* Lam. | *neilrechii* A.Kern. |
| *pubescens* Willd. | *setacea* Waldst.et Kit. | **_Artemisia_ L.** | *vermicularis* Trin. | *nobilis* L. |
| *sachokiana* D.Sosn. | *sachokiana* Sosn. | *absinthium* L. | *wilhelmsii* C.Koch | *ptarmicifolia* (Willd.) |
| *santolina* L. | *tenuifolia* Lam. | *annua* L. | **_Artemisia_ L.** | Rupr. ex Heimerl. |
| *setacea* Waldst.et Kit. | *vermicularis* Trin. | *arenaria* DC. | *abrotanum* L. | *tenuifolia* Lam. |
| *tenuifolia* Lam. | *wilhelmsii* C.Koch | *armeniaca* Lam. | *absinthium* L. | *vermicularis* Trin. |
| *vermicularis* Trin. | **_Artemisia_ L.** | *austriaca* Jacq. | *annua* L. | *wilhelmsii* C.Koch |
| **_Artemisia_ L.** | *absinthium* L. | *campestris* L. | ○*araxina* Takht. | **_Artemisia_ L.** |
| *absinthium* L. | *annua* L. | *caucasica* Willd. | *armeniaca* Lam. | *abrotanum* L. |
| *annua* L. | *arenaria* D.C. | *chamaemelifolia* Vill. | *austriaca* Jacq. | *absinthium* L. |
| *arenaria* D.C. | *armeniaca* Lam. | *fasciculate* M.Bieb. | *caucasica* Willd. | *annua* L. |
| *armeniaca* Lam. | *austriaca* Jacq. | *lerchiana* Web. | *chamaemelifolia* Vill. | *araxina* Takht. |
| *austriaca* Jacq. | *campestris* L. | *monogyna* Waldst.et Kit. | **dracunculus* L. | *armeniaca* Lam. |
| *campestris* L. | *caucasica* Willd. | *scoparia* Waldst.et Kit. | *fragrans* Willd. | *austriaca* Jacq. |
| *caucasica* Willd. | *chamaemelifolia* Vill. | *spicigera* C.Koch. | *incana* (L.) Druce | *caucasica* Willd. |
| *chamaemelifolia* Vill. | **dracunculus* L. | *splendens* Willd. | *marschalliana* Spreng. | *chamaemelifolia* Vill. |
| **dracunculus* L. | *fasciculate* M.B. | *szowitziana* (Bess.) | *santonica* L. | **dracunculus* L. |
| *fasciculate* M.B. | *monogyna* Waldst.et | Groosh. | *scoparia* Waldst.et Kit. | *fragrans* Willd. |
| *fragrans* Willd. | Kit. | *vulgaris* L. | *spicigera* C.Koch. | *incana* (L.) Druce |
| *monogyna* Waldst.et | *fragrans* Willd. | **_Lepidotheca_ Nutt.** | *splendens* Willd. | *marschalliana* Spreng. |
| Kit. | *scoparia* Waldst.et Kit. | *aurea* (L.) Kovalevsk. | ○*szowitziana* (Bess.) | *santonica* L. |
| *scoparia* Waldst.et Kit. | *spicigera* C.Koch. | **_Leucanthemum_ Hill.** | Groosh. | *scoparia* Waldst.et Kit. |
| *splendens* Willd. | *splendens* Willd. | *vulgare* Lam. | *tschernieviana* Bess. | *spicigera* C.Koch. |
| *szowitziana* (Bess.) | *szowitziana* (Bess.) | **_Matricaria_ L.** | *vulgaris* L | *splendens* Willd. |
| A.Groosh. | Groosh. | *recutita* L. | **_Leucanthemum_ Hill.** | *szowitziana* (Bess.) |
| *spicigera* C.Koch. | *vulgaris* L. | **_Pyrethrum_ Zinn.** | *vulgare* Lam. | Groosh. |
| *vulgaris* L. | **_Leucanthemum_ Mill.** | *balsamita (L.)* Willd. | **_Matricaria_ L.** | *tschernieviana* Bess. |
| **_Leucanthemum_ Hill.** | *vulgare* Lam. | *carneum* Bieb. | *aurea* (Loefl.) Sch. | *vulgaris* L |
| *vulgare* Lam. | **_Matricaria_ L.** | **cinerariifolium* Trev. | **matricarioides* (Less.) | **_Leucanthemum_ Hill.** |

| | | | | |
|---|---|---|---|---|
| ***Matricaria* L.**<br>*aurea* (L.) Boiss.<br>*chamomilla* L.<br>***Pyrethrum* Gaertn.**<br>*balsamita* (L.) Willd.<br>*carneum* M.B.<br>*cheilanthifolium* D.Sosn.<br>*chiliophyllum* F. et M.<br>*cinerariifolium Trev.<br>*corymbosum* (L.) Willd.<br>○*daghestanicum* ( Boiss.) Flerov<br>*divaricatum* D.Sosn.<br>*grossheimii* D.Sosn.<br>○*komarovii* D.Sosn.<br>*kotschyi* Boiss.<br>○*kubense* A.Grossh.<br>○*leptophyllum* Stev. ex M.B.<br>*longipedunculatum* D.Sosn.<br>*macrophyllum* (Waldst. et Kit) Willd.<br>●*meyerianum* D.Sosn.<br>*myriopyllum* C.A.M.<br>*niveum* Lag.<br>*ordubadense* Manden.<br>*parthenifolium* Willd.<br>○*punctatum* (Desr.) Bordz. ex D.Sosn.<br>*roseum* (Ad.) M.B.<br>*sericeum* (Ad.) M.B.<br>*sevanense* D.Sosn.<br>*sosnowskyanum* A.Grossh.<br>*tamrutense* D.Sosn.<br>*transcaucasicum* D.Sosn.<br>*uniflorum* F. et M.<br>***Tanacetum* L.**<br>*canescens* D.C.<br>*millefoliatum* F. et M.<br>*tabrisianum* (Boiss.) A.Grossh.<br>*tenuissimum* (Trautv.) A.Grossh.<br>***Chamaemelum* Mill.**<br>○*caucasicum* (Willd.) Boiss.<br>*disciforme* (C.A.M.) Vis.<br>*inodorum* (L.) Vis.<br>*karyaginii* Manden. et Sof.<br>*melanolepis* Boiss. et Buhse<br>*monticolum* Boiss. et Huet.<br>*praecox* (M.B.) Vis.<br>*silaifolium* (Stev.) Trautv.<br>○*transcaucasicum* Manden.<br>***Chrysantemum L.**<br>*indicum L. | *aurea* (L.) Boiss.<br>*matricarioides (Less.) Porter<br>*recutita* L.<br>***Pyrethrum* Zinn.**<br>*balsamita* (L.) Willd.<br>*cinerariifolium Trev.<br>*coccineum* (Willd.) Worosch.<br>*corymbosum* (L.) Willd.<br>○*daghestanicum* (Rupr. ex Boiss.) Rupr. ex Flerov<br>*grossheimii* Sosn.<br>○*komarovii* Sosn.<br>*kotschyi* Boiss.<br>○*kubense* Grossh.<br>○*leptophyllum* Stev. ex M.B.<br>*macrophyllum* (Waldst. et Kit) Willd.<br>*ordubadense* Manden.<br>*parthenifolium* Willd.<br>○*punctatum* (Desr.) Bordz.<br>*roseum* (Adam) M.B.<br>*sericeum* (Adam) M.B.<br>*sevanense* Sosn.<br>***Tanacetum* L.**<br>*canescens* D.C.<br>*chiliophyllum* (F. et M.) Sch.Bip.<br>*longipedunculatum* (Sosn.) Tzvel.<br>*millefolium* (L.) Tzvel.<br>*myriopyllum* Willd.<br>*tamrutense* D.Sosn.<br>*tabrisianum* (Sosn.) Sosn.<br>*tenuissimum* (Trautv.) Grossh.<br>*uniflorum* (F. et M.) Sch.Bip.<br>***Tripleurospermum* Sch.Bip. = *Chamaemelum* Mill.**<br>*caucasicum* (Willd.) Hayek.<br>*disciforme* (C.A.Mey.) Sch.Bip.<br>*inodorum* (L.) Sch.Bip.<br>*karyaginii* (Manden. et Sof.) Pobed.<br>*parviflorum* (Willd.) Pobed.<br>*subnivale* Pobed.<br>*transcaucasicum* (Manden.) Pobed. | *coccineum* (Willd.) Worosch.<br>*corymbosum* (L.) Scop.<br>○*daghestanicum* (Rupr. ex Boiss.) Fler.<br>*grossheimii* Sosn.<br>○*komarovii* Sosn.<br>*kotschyi* Boiss.<br>○*kubense* Grossh.<br>○*leptophyllum* Stev. ex Bieb.<br>*macrophyllum* (Waldst. et Kit) Willd.<br>●*meyerianum* Sosn.<br>*ordubadense* Manden.<br>*parthenifolium* Willd.<br>○*punctatum* (Desr.) Bordz. ex Grossh. et Schischk.<br>*sericeum* (Adams.) Bieb.<br>*sevanense* Sosn.<br>○*silaifolium* Stev.<br>***Ptarmica* Hill.**<br>*biserrata* (Bieb.) DC.<br>*ptarmicifolia* (Willd.) Galushko<br>*sachokiana* (Sosn.) Klok. et Krytzka<br>***Tanacetum* L.**<br>*argyrophyllum* (C.Koch.) Tzvel.<br>*canescens* DC.<br>*chiliophyllum* (Fisch. et C.A.Mey.)<br>*longipedunculatum* (Sosn.) Tzvel.<br>*millefoliatum* Fisch. et Mey.<br>*tabrisianum* (Boiss.) Sosn. et Takht.<br>*tamrutense* (Sosn.) Sosn. Sch.Bip.<br>*tenuissimum* (Trautv.) Grossh.<br>*uniflorum* (Fisch. et C.A.Mey.) Sch.Bip.<br>***Tripleurospermum* Sch.Bip.= *Chamaemelum* Mill.**<br>○*caucasicum* (Willd.) Hayek.<br>*disciforme*(C.A.Mey.) Sch.Bip.<br>*karyaginii* (Manden. et Sof.) Pobed.<br>*monticolum* Bornm.<br>*parviflorum* (Willd.) Pobed.<br>*perforatum* (Merat.) M.Lainz.<br>○*transcaucasicum* (Manden.) Pobed.<br>○*tzvelevii* Pobed.<br>***Chrysantemum L.**<br>*indicum L.<br>*maximum L. | Porter<br>*recutita* L.<br>***Tanacetum* L.=*Pyrethrum* Zinn.**<br>*abrotanifolium* (L.) Druce<br>*argyrophyllum* (C.Koch.) Tzvel.<br>*balsamitoides* (Nabelek) Chand.<br>*canescens* DC.<br>*chiliophyllum* (Fisch. et C.A.Mey.) Sch.Bip.<br>*cinerariifolium Trev.<br>*coccineum* (Willd.) Grierson<br>*corymbosum* (L.) Sch.Bip.<br>*duderanum* (Boiss.) Tzvel.<br>*dumosum* Boiss.<br>*kotschyi* (Boiss.) Grierson<br>○*leptophyllum* Stev. ex Bieb.<br>●*meyerianum* Sosn.<br>*millefoliatum* Fisch. et Mey.<br>*niveum* Lag.<br>*parthenifolium* (Willd.) Sch.Bip.<br>○*punctatum* (Desr.) Grierson<br>*sericeum* (Adams.) Sch.Bip.<br>○*silaifolium* (Stev.) Sch.Bip.<br>*sorbifolium* (Boiss.) Grierson<br>*tabrisianum* (Boiss.) Groosh.<br>*tamrutense* (Sosn.) Sosn.<br>*uniflorum* (Fisch. et C.A.Mey. ex DC.) Sch.Bip.<br>*vulgare L.<br>○*zangezuricum* Chand.<br>***Tripleurospemum* Sch.Bip.= *Chamaemelum* Mill.**<br>○*caucasicum* (Willd.) Hayek.<br>*disciforme* (C.A.Mey.) Sch.Bip.<br>*inodorum* (L.) Sch.Bip.<br>*parviflorum* (Willd.) Pobed.<br>*tenuifolium* (Kit.) Freyn.<br>○*transcaucasicum* (Manden.) Pobed. | *vulgare* Lam.<br>***Matricaria* L.**<br>*aurea* (Loefl.) Sch.<br>*matricarioides (Less.) Porter<br>*recutita* L.<br>***Tanacetum* L.=*Pyrethrum* Zinn.**<br>*abrotanifolium* (L.) Druce<br>*argyrophyllum* (C.Koch.) Tzvel.<br>*balsamitoides* (Nabelek) Chand.<br>*canescens* DC.<br>*chiliophyllum* (Fisch. et C.A.Mey.) Sch.Bip.<br>*cinerariifolium Trev.<br>*coccineum* (Willd.) Grierson<br>*corymbosum* (L.) Sch.Bip.<br>*duderanum* (Boiss.) Tzvel.<br>*dumosum* Boiss.<br>*kotschyi* (Boiss.) Grierson<br>○*leptophyllum* Stev. ex Bieb.<br>*meyerianum* Sosn.<br>*millefoliatum* Fisch. et Mey.<br>*niveum* Lag.<br>*parthenifolium* (Willd.) Sch.Bip.<br>*punctatum* (Desr.) Grierson<br>*sericeum* (Adams.) Sch.Bip.<br>○*silaifolium* (Stev.) Sch.Bip.<br>*sorbifolium* (Boiss.) Grierson<br>*tabrisianum* (Boiss.) Groosh.<br>*tamrutense* (Sosn.) Sosn.<br>*uniflorum* (Fisch. et C.A.Mey. ex DC.) Sch.Bip.<br>*vulgare L.<br>*zangezuricum* Chand.<br>***Tripleurospermum* Sch.Bip.= *Chamaemelum* Mill.**<br>○*caucasicum* (Willd.) Hayek.<br>*disciforme* (C.A.Mey.) Sch.Bip.<br>*karjaginii* (Manden. et Sof.) Pobed.<br>*parviflorum* (Willd.) Pobed.<br>*perforatum* (Merat.) M.Lainz.<br>*tenuifolium* (Kit.) Freyn.<br>*transcaucasicum* (Manden.) Pobed.<br>***Chrysantemum L.**<br>*indicum L.<br>*maximum L. |

*A. setacea* morfolojı quruluşca və efir yağının komponent tərkibinə (mentol, 1,8-sineol) görə *A. millefolium* (evgenol, izoevgenol) növündən fərqləndiyindən biz onu sərbəst növ kimi saxlamışıq. Yuxarıda qeyd etdiyimiz kimi *A.nabelekii* tərəfimizdən Azərbaycan florası üçün təsdiqlənmişdir. O, efir yağının əsas komponent tərkibinə (evgenol, timol) görə də *A. nobilis* (sitronellal, kamfora) və *A. setacea* (kamfora, izoevgenol) növlərindən fərqlənir (Мустафаева, 2009).

Apardığımız araşdırmalara görə cins hal-hazırda 13 növlə floramızda təmsil olunur: *A. bieberşteinii, A. biserrata, A. cuneatiloba, A. filipendulina, A. millefolium, A. nabelekii, A. neilrechii, A. nobilis, A. ptarmicifolia, A. setacea, A. tenuifolia, A. vermicularis, A. wilhelmsii. A. ptarmicifolia* və *A. grandiflora* sinonim növlər olduğu üçün, son ədəbiyyat məlumatalarını nəzərə alaraq, biz onlardan birinin - *A. ptarmicifolia* adının qalmasını zəruri saydıq.

*Matricaria* cinsinin *M.chamomilla* növü "Флора СССР"-ə görə (1961) *M. recutita, M.aurea* növü S.K.Çerepanova görə (1995) *Lepidotheca aurea,* sonralar isə "Конспект флоры Кавказа" (2008) görə isə yenidən *M.aurea* adlandırılmışdır. *M. matricarioides* (Less.) Porter növü isə ölkəmizdə becərilir. Hal-hazırda *Matricaria* cinsi Azərbaycanda 3 növlə təmsil olunur: *M. recutita, M.aurea* və *M. matricarioides.*

Tribanın ən böyük cinslərindən olan *Pyrethrum* cinsi Azərbaycan florasında (1961) 27 yabanı və 1 mədəni, *Tanacetum* isə 4 növlə təmsil olmuşdur. Son nomenklatur dəyişikliklərə əsasən (Черепанов, 1995) *Pyrethrum* cinsinin 5 növü *Tanacetum* cinsinin tərkibinə keçdiyinə görə cins floramızda 9 növlə, *Pyrethrum* cinsi isə *Chamaemelum silaifolium* (Stev.) Trautv. növü də onun tərkibinə keçdiyinə görə (*Pyrethrum silaifolium* Stev.), Azərbaycan ərazisində 23 yabanı və 1 mədəni növlə təmsil olunmuşdur. Son illərin ədəbiyyat məlumatlarına görə (Əsgərov, 2011; Конспект флоры Кавказа, 2008) isə *Pyrethrum* cinsi bütünlüklə *Tanacetum* cinsinin tərkibinə keçmiş və cins floramızda 25 növlə səciyyələnir (cədvəl 3).

Biz *Pyrethrum* cinsinin sərbəst cins kimi saxlanılmasının tərəfdarıyıq. Çünki morfoloji quruluşuna görə *Pyrethrum* cinsi *Tanacetum* cinsindən fərqlənir. Bildiyimiz kimi, *Tanacetum* cinsi növlərində dilcikşəkilli çiçəklər ya yoxdur, ya da çox qısadır, əsasən səbətlərində boruşəkilli çiçəklər üstünlük təşkil edir və bütün çiçəklər sarı rəngdədir. S.K.Çerepanov da *Pyrethrum* cinsinin dilcikşəkilli çiçəklərinin çox qısa və sarı rəngdə olan növlərini *Tanacetum* cinsinə keçirmiş, lakin dilcikşəkilli çiçəklərinin yaxşı inkişaf etmiş, ağ və çəhrayı rəngdə olan növlərini isə *Pyrethrum* cinsinin tərkibində saxlamışdır. N.N. Svelyov da (Флора СССР, 1961) *Pyrethrum* cinsini dilcikşəkilli çiçəklərinin rənginə görə sərbəst cins kimi saxlamışdır. Bütün bunları nəzərə alaraq, bizə görə hal-hazırda *Pyrethrum* cinsi floramızda 17 (*P. balsamita, P. Cinerariifolium, P. carneum, P. coccineum, P. silaifolium, P. daghestanicum, P. komarovii, P.kotschyi, P. meyerianum, P. punctatum, P. corymbosum, P. leptophyllum, P. parthenifolium, P. niveum, P. sevanense, P. sericeum, P. Macrophyllum*), *Tanacetum* isə 8 (*T. argyrophyllum, T. canescens, T. chiliophyllum, T. uniflorum, T. dumosum, T. millefoliatum, T. tabrisianum, T. tamrutense*) növlə təmsil olunur.

Azərbaycan florasında 9 növü olan və *Chamaemelum* adı ilə tanınan, sonralar (7 növ "Флора СССР"-ə və 8 növ – S.K.Çerepanova görə) və halhazırda (6 növ - "Конспект флоры Кавказа" və 7 növ - A.M.Əsgərova (2011) görə) isə *Tripleurospermum* adlanan cinsin tərkibində də bir sıra dəyişikliklər olmuşdur (cədvəl 3). Belə ki, S.K.Çerepanova (1995) görə *Chamaemelum inodorum* növü *Tripleurospermum perforatum*; *Chamaemelum praecox - Tripleurospermum parviflorum; Chamaemelum karjaginii və Ch.melanolepis Tripleurospermum karjaginii*, *Chamaemelum monticolum - Tripleurospermum monticolum; Matricaria azerbaidshanica - Tripleurospermum tzvelevii,* "Конспект флоры Кавказа" (2008) və A.M.Əsgərova (2011) görə isə *Tripleurospermum perforatum, Chamaemelum inodorum* novləri *Tripleurospermum inodorum; Tripleurospermum tzvelevii, Matricaria azerbaidshanica - Tripleurospermum tenuifolium; Chamaemelum caucasicum, Ch.karjaginii, Ch.melanolepis - Tripleurospermum caucasicum* adlandırılmışdır. Hal-hazırda *Tripleurospermum* cinsinin floramızda 7 (*T. inodorum, T. tenuifolium, T.caucasicum, T. transcaucasicum, T. disciforme, T.monticolum, T. parviflorum*) növünün olduğu müəyyən edilmişdir.

Tribanın *Chrysantemum* cinsinin bizə məlum *Ch. indicum* növü ilə yanaşı, hal-hazırda ölkəmizdə *Ch. maximum* növü də becərilir.

Biz əlbəttə ki, APG III sistemi ilə də tanışıq. Bu sistem çiçəkli bitkilərin təsnifatının müasir taksonomik sistemidir. Burada əsasən böyük taksonlar – sıra və fəsilələr təmsil olunmuşdur (Angiosperm Phylogeny Group, 2009).

Aparılmış tədqiqatlara əsasən, son nomenklatura (Черепанов, 1995) və ədəbiyyat məlumatlarını (Флора Азербайджана, 1961; Флора СССР, 1961; Конспект флоры Кавказа, 2008Əsgərov 2008; 2011) müqayisəli təhlil etdikdən sonra, müəyyən etmişik ki, Azərbaycan florasında hal-hazırda *Anthemideae* tribasının 10 cinsdə cəmlənən 108 növünə rast gəlinir (cədvəl 3).

**Cədvəl 3**. Azərbaycan florasında *Anthemideae* tribasının cins və növləri

| № Cinslər | Növlərin sayı | Ümumi saya görə %-i |
|---|---|---|
| 1. *Anacyclus* L. | 1 | 0,9 |
| 2. *Anthemis* L. | 14 | 13.0 |
| 3. *Achillea* L. | 13 | 12.0 |
| 4. *Artemisia* L. | 42 | 8.9 |
| 5. *Matricaria* L. | 3 | 2.8 |
| 6. *Leucanthemum* Hill. | 1 | 0.9 |
| 7. *Chrysanthemum* L. | 2 | 1.9 |
| 8. *Pyrethrum* Zinn. | 17 | 15.7 |
| 9. *Tanacetum* L | 8 | 7.4 |
| 10. *Tripleurospermum* Sch.Bip. | 7 | 6.5 |
| Cəmi | 108 | 100 |

**Cədvəl 4.** Azərbaycan florasında yayılan *Anthemideae* tribasının növləri

| № | Cinslər | Növlər |
|---|---|---|
| 1. | *Anacyclus* L. | ○ *Anacyclus ciliatus* Trautv. |
| 2. | *Anthemis* L. | *Anthemis iberica* Bieb., ○*A. fruticulosa* Bieb., ○ *A. sosnovskyana* Fed., *A. ruthenica* Bieb., *A. candidissima* Willd. ex Spreng., *A. karabaghensis* A.D.Mikheev, *A. cotula* L., *A. tinctoria* L., *A. triumfettii* (L.) All., *A. melanoloma* Trautv., *A. altissima* L., *A. austriaca* Jacq., *A. dumetorum* Sosn., *A. woronowii* Sosn. |
| 3. | *Achillea* L. | ○*Achillea biserrata* Bieb., ○*A. ptarmicifolia* (Willd.) Rupr. ex Heimerl., *A. millefolium* L., *A. nobilis* L., *A. neilrechii* A.Kern., *A. nabelekii* Heimerl., *A. setacea* Waldst. et Kit., *A. filipendulina* Lam., *A. bieberşteinii* Afan., *A. cuneatiloba* Boiss. et Buhse, *A. wilhelmsii* C.Koch, *A. vermicularis* Trin., *A. tenuifolia* Lam. |
| 4. | *Artemisia* L.. | *Artemisia dracunculus* L., *A. tscherneviana* Bess., *A. marschalliana* Spr., *A. sosnovskyi* Krasch., *A. scoparia* Waldst. et Kit., *A. scoparoides* Grossh., *A. orientalis* Willd., *A. austriaca* Jacq., *A. atropatona* Rzazade, *A. vulgaris* L., *A. armenica* Lam., *A. chamaemelifolia* Vill., *A. annua* L., *A. absinthium* L., *A. caucasica* Willd., *A. splendens* Willd., *A. spicigera* C. Koch., *A. fragrans* Willd., *A. szowitsiana* (Bess.) Gros., *A. divaricata* (Grossh.) Rza., *A. eldarica* Rzazade, *A. Issayevi* Rzazade, *A. paucflora* Web., *A. hanseniana* (Bess.), *A. hans. var. phyllastachys* Rza., *A. han. var. yasamalica* Rza., *A. apscheranica* Rzazade, *A. kobstanica* Rzazade, *A. nachitschevanica* Rza., *A. fedorovii* Rzazade, *A. prilipkoana* Rzazade, *A. iskenderiana* Rzazade, *A. isken.var. babadaq* Rza., *A. iskn. var. konaqkendica* Rza., *A. muganica* Rzazade, *A. chazarica* Rzazade, *A. popovii* Rzazade, *A.abratanum* L., *A. fasciculata* Bieb., *A. salsoloides* Willd., *A.laşchinica* Rzazade, *A.dagistanica* Rzazade |
| 5. | *Leucanthemum* Hill. | *Leucanthemum vulgare* Lam. |
| 6. | *Matricaria* L. | *Matricaria aurea* (Loefl.) Sch.Bip., *M.recutita* L., **M.matricarioides* (Less.) Porter |
| 7. | *Pyrethrum* Zinn. | *Pyrethrum balsamita (L.)* Willd., **P. cinerariifolium* Trev., *P. carneum* Bieb., *P. coccineum* (Willd.) Worosch., ○*P. silaifolium* Stev., ○*P. daghestanicum* (Rupr. ex Boiss.) Fler., ○*P. komarovii* Sosn., *P.kotschyi* Boiss., ● *P. meyerianum* Sosn., ○ *P. punctatum* (Desr.) Bordz. ex Grossh. et Schischk., *P. corymbosum* (L.) Scop., ○ *P. leptophyllum* Stev. ex Bieb., *P. parthenifolium* Willd., *P. sevanense* Sosn., *P. sericeum* (Adams.) Bieb., *P. macrophyllum* (Waldst. et Kit) Willd. |
| 8. | *Tanacetum* L. | *Tanacetum argyrophyllum* (C.Koch.) Tzvel., *T. canescens* DC., *T. chiliophyllum* (Fisch. et C.A.Mey.) Sch.Bip., *T. uniflorum* (Fisch. et C.A.Mey.) Sch.Bip., *T. dumosum* Boiss., *T. millefoliatum* Fisch. et Mey., *T. tabrisianum* (Boiss.) Sosn. et Takht., *T. tamrutense* (Sosn.) Sosn. Sch.Bip. |
| 9. | *Tripleurospermum* Sch.Bip. | *Tripleurospermum inodorum* (*L.)* Sch.Bip., ○*T. tenuifolium (Kit.) Freyn.,* ○*T.caucasicum* (Willd.) Hayek., ○*T. transcaucasicum* (Manden.) Pobed., *T. disciforme* (C.A.Mey.) Sch.Bip., *T.monticolum* Bornm., *T. parviflorum* (Willd.) Pobed. |
| 10. | *Chrysanthemum* L. | * *Chrysanthemum indicum* L., **Ch.maximum* L. |

Cədvəl 4-dən göründüyü kimi, tribanın, taksonomik baxımdan, ən çox növ sayına *Artemisia, Pyrethrum, Anthemis, Achillea,* bir qədər az *Tanacetum, Tripleurospermum,* daha az isə *Matricaria, Chrysanthemum, Anacyclus* və *Leucanthemum* cinsləri malikdir. Cədvəl 4-də isə *Anthemideae* tribasının növləri təsvir olunmuşdur.

Tribanın növlərinə düzənlikdən tutmuş alp dağ qurşağına qədər quru yamaclarda, qayalıqların çatlarında, çınqıllıqlarda, meşələrdə, bağlarda, çəmənlərdə, çay kənarlarında, əkinlərdə, töküntülü yerlərdə, ağaclar və kolluqlar arasında, yol boyunca rast gəlmək olar. Nümayəndələri, demək olar ki, hamısı faydalı bitkilər olub, dərman, efir yağlı, texniki,

yem, dekorativ və s. bitkilər kimi istifadə olunurlar (Mustafayeva, 2009; Mustafayeva, 2009; Mustafayeva, 2011; Мустафаева, 1989; Мустафаева, 2010; Мустафаева и др., 2011; Sahmurova, 2010). Onlar əsasən alaq, meşə-çəmən, meşə-kol, dağ-kserofit, çal-çəmən, çəmən-bozqır, dağ-çəmən bitkilik tiplərinin nümayəndələridir.

## ƏDƏBIYYAT


**Ələsgərova A.N., İbadullayeva S.C.** (2011) Azərbaycan florasında yovşan növlərinin bitkilik tipində rolu. AMEA-nın Məruzələri, **LXVII (1):** 132-138.

**Ələsgərova A.N.** (2012) Azərbaycan florasında yovşan cinsi növlərinin xemotaksonomik tədqiqinə dair (İcmal). AMEA Botanika İnstitutunun elmi əsərləri, **XXXII:** 120-141.

**Əsgərov A.M. (**2008) Azərbaycanın ali bitkiləri (*Lamiaceae, Asteraceae*). Azərbaycan florasının konspekti. Bakı:" Elm", **III:** 75-77.

**Əsgərov A.M.** (2011) Azərbaycan florasının konspekti. Əlavələr və dəyişikliklərlə: 1961- 2009. Bakı:" Elm", 202 s.

**Mustafayeva S.C.** (2009) *Achillea nabelekii* Heimerl. növünün Azərbaycanda yayılması. AMEA Botanika İnstitututnun elmi əsərləri, **XXIX:** s.445-450.

**Mustafayeva S.C.** (2009) *Anthemideae* Cass. tribinin dekorativ bitkiləri və onların əhəmiyyəti. AMEA Mərkəzi Nəbatat bağının 75 illiyinə həsr olunmuş «Bioloji müxtəliflik və bitkilərin introduksiyası» beynəlxalq elmi konfrans, Bakı, 23-24 sentyabr, s: 127-130.

**Mustafayeva S.C.** (2011) Azərbaycan florasında *Anthemis cotula* L. (*Asteraceae* Dumort.) növünün efiryağlılığı haqqında. AMEA Botanika İnstitutu "Faydalı bitkilərdən istifadənin aktual problemləri"- beynəlxalq konfransın materialları, Bakı, s:152-154.

**Конспект флоры Кавказа**. (2008) Санкт-Петербург- Москва, **III (I):** 469 с.

**Мустафаева С.Д.** (1989) Биологические особенности и эфирномасличность видов рода *Achillea* L. флоры Азербайджана. Автор. дисс. соис. уч. ст. канд. биол. наук, Баку, 24 с.

**Мустафаева С.Д.** (2010) Лечебное применение *Matricaria recutita* (L.) Rauschert. в народной и официальной медицине разных стран. Ж. «Традиционная медицина», **3:** 63- 66.

**Мустафаева С.Д., Зейналова С.А., Гусейнова Т.И., Исмаилов Э.И., Бахшалиева К.Ф.** (2011) Изучение компонентного состава и антифунгальной активности эфирного масла *Pyrethrum sevanense* Sosn. флоры Азербайджана. «Azərbaycan əzcaçılıq və farmakologiya jurnalı, **1:** 14-18.

**Полевая геоботаника** (1964) М.-Л.:«Наука», **3**, 530 С.

**Рзазаде Р.Я.** (1955) Новые виды, ряды и подроды Кавказских полыней. Изв. АН Азерб.ССР, **3:** 17-35

**Флора Грузии** (1952) Изд-во АН Груз. ССР, Тбилиси, **VIII:** 330.

**Флора Азербайджана** (1961) Изд-во АН Азерб. ССР, Баку, **VIII:** 265-276.

**Флора СССР** (1961) Изд-во АН СССР, М.-Л, XXVI: 938 с.

**Черепанов С.К.** (1995) Сосудистые растения России и сопредельных государств (в пределах бывшего СССР). Мир и семья, Санкт- Петербург, 992 с.

**Angiosperm Phylogeny Group** (2009) An update of the Angiosperm Phylogeny Group classification for the orders and families of flowering plants: APG III. Botanical Journal of the Linnean Society : журнал Лондон, **16( 2):** 105-121.

**Oberprieler C., Himmelreich S.,Vogt R.** (2007) A new subtribal classification of the Tribe *Anthemideae* (*Compositae*). Willdenowia, **37**: 89-114.

**Sahmurova A., Brent Philip Durcan, Bahshaliyeva K., Mehtiyeva N., Mustafayeva S.J.** (2010) Chemical composition and antifungal activities of essential oils of *Pyrethrum leptophyllum* Stev. ex Bieb. Journal of Residuals science and Technology (JRS&T), USA, **7(3):** 187-190.

**Ревизия Трибы *Anthemideae* Cass. (сем. *Asteraceae* Bercht. et J.Presl)
Флоры Азербайджана**

**С.Д. Мустафаева**

*Институт ботаники НАНА*

В статье приводится сравнительный анализ таксономического состава трибы *Anthemideae* флоры Азербайджана. В результате проведенных исследований установлено, что в настоящее время во флоре Азербайджана триба *Anthemideae* представлена 10 родами и 108 видами.

***Ключевые слова:*** *Asteraceae, Anthemideae, триба, род, вид, таксономия*

**Revision of Tribes of *Anthemideae* Cass. (family *Asteraceae* Bercht. et J.Presl)
in the Flora of Azerbaijan**

**S.C. Mustafayeva**

*Institute of Botany*

The article presents a comparative analysis of the taxonomic composition of the genera and species of the tribe *Anthemideae* in the flora of Azerbaijan. Currently the tribe *Anthemideae* is represented by 10 genera and 108 species in the flora of Azerbaijan.

***Key words:*** *Asteraceae, Anthemideae, tribe, genus, species, taxonomy*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 44-48 (2014)

# Abşeronda Tut Ağacına Zərər Verən Tut Çanaqlı Yastıcasının (*Homoptera, Pseudaulacaspis Pentagona* (Targ-Toz.)) Parazit və Yırtıcıları

**G.Ə. İsmayılova**

*AMEA Zoologiya İnstitutu, A.Abasov küç., 1128 döngə, Bakı AZ1073;Azərbaycan;*
*E-mail:gulnas-ikmet@mail.ru*

**Məqalədə tut ağacına ciddi zərər verən *Pseudaulacaspis pentagona* (Targ-Toz.) - tut çanaqlı yastıcasından və onun biotənzimlənməsində iştirak edən parazit və yırtıcılar haqqında məlumat verilir. Müəyyən olunmuşdur ki, bu zərərvericinin sayının biotənzimlənməsində yırtıcı *Chilocorus bipustulatus L.* parabüzəni və parazit *Encarsia auranti* (*Chalcididae*) daha effektlidir. Tut çanaqlı yastıcasına qarşı bioloji mübarizədə istifadə etmək məqsədilə onların bioekoloji xüsusiyyətləri, təsərrüfat əhəmiyyəti və yayılmaları öyrənilmişdir.**

***Açar sözlər:*** *tut ağacı, zərərverici, yastıca, parazit, böcək, bioloji mübarizə*

## GİRİŞ

Tut ağacı tutkimilər (*Moraceae*) fəsiləsinin tut cinsinə (*Morus*) daxildir. Bu cinsin nümayəndələri mülayim, tropik və subtropik zonalarda geniş yayılmışdır. Azərbaycanda tut bitkisinin bir çox növləri yayılıb, eyni zamanda qiymətli bitki kimi respublikanın əksər rayonlarında çox qədimdən becərilir. Abşeronda qara və ağ tut daha geniş yayılmışdır. Tut bitkisi uzunömürlü, tez böyüyən, çoxillik ağac cinsinə aid olub, işıq və istilik sevən bitkidir, susuzluğa dözümlüdür. Arıçılıq sənayesində böyük əhəmiyyəti vardır. Köklərinin qabığından və yarpaqlarından dərman vasitəsi kimi istifadə edilir. Tacının sıxlığına və ağacların dekorativliyinə görə ağ tutun bir sıra formaları (ağlayan, şarşəkilli, piramidal, qızılı, ilan formalı) dekorativ bitki kimi yaşayış məntəqələrinin yaşıllaşdırılmasında istifadə olunur. Qidalı maddələri ilə zəngin olan tutun yarpaqları ipək qurdunun tırtılları üçün əvəzolunmaz qida mənbəyidir. Tut ağacı yalnız ipəkçilik üçün xammal olmayıb, insanların ərzaq rasionunda da əhəmiyyətli yer tutur. Tut ağacı da digər meşə və meyvə ağacları kimi zərərvericilər tərəfindən yoluxurlar. Son illərdə aşkar olunmuşdur ki, tut ağacına bir sıra həşəratlar ciddi ziyan vurduğuna görə bu bitkinin sistemli şəkildə mühafizəyə ehtiyacı vardır. Sənaye və ərzaq məhsulu kimi əhəmiyyətini nəzərə alaraq Abşeron yarımadasında tut ağacının inkişafına və çoxalmasına təsir edən zərərvericilərinin növ tərkibinin aşkar edilməsi, onların bioekoloji xüsusiyyətləri, yayılması və entomofaqlarının öyrənilməsi vacib məsələlərdən biridir.

## MATERİAL VƏ METODLAR

Materialın toplanması və işlənməsi entomologiyada qəbul edilmiş üsullarla həyata keçirilmişdir (Борхсениус, 1963, İsmayılova və b., 2008). Müşahidələr seçilmiş eyni bitkilər üzərində aparılmışdır. Bu məqsədlə hər dekadada ağaclardan 50 yarpaq və ya 10 sm uzunluğunda 10 zoğ götürülmüşdür. Başlıca növlərin inkişaf fenologiyası öyrənilmişdir. Yastıcalar bitkilərlə birlikdə qurudulmuşdur. Parazitləri öyrənmək üçün yoluxmuş budaqlar qapalı şüşə qablara yığılmışdır.Tədqiqat müddətində çoxlu sayda şəkillər və videomateriallar çəkilmişdir. Məqalədə verilmiş şəkillər 2007-2008-cu illərdə Sony DSC-T70 fotoaparatı ilə çəkilmiş və şəxsi arxivdə saxlanılır.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Son dövrlərdə Abşeronda tut çanaqlı yastıcası tut bitkisinin ciddi zərərvericisinə çevrilmişdir. Tut çanaqlı yastıcasının vətəni Çin, Koreya və Yaponiyadır. Karantin zərərvericidir. Polifaq olduğuna görə, tutdan başqa bir çox meyvə və meşə ağaclarına, giləmeyvə və dekorativ bitkilərə zərər vurur (Mustafayeva, 2003). Zoğ, budaq və gövdədə məskunlaşır. Yoluxma yüksək olduqda tutun hətta meyvələrində də məskunlaşaraq, məhsulu məhv edirlər. Bitkinin şirəsi ilə qidalanaraq onların zəifləməsinə və qurumasına səbəb olur. Yumurta qoyma qabiliyyətinin çox yüksək olması, ekoloji sıxlığı bu zərərvericinin çox sürətlə yayılmasına səbəb olur. Populyasiyanın sıxlığı yüksək olduqda budaqların cavan zoğlarında yalnız dişilər məskunlaşır (Şəkil 1). Erkəklər əsasən qalın budaqlarda və gövdədə üstünlük təşkil edirlər. Güclü yoluxma zamanı erkəklərin populyasiyasının sayı çox olduqda ağacın budağı erkək çanaqlarla o qədər sıx olur ki, budaq təmamilə ağappaq görünür (Şəkil 2.). Yastıca kəskin cinsi dimorfizmə malikdir. Mayalanmış dişilər qışlayırlar. Dişinin inkişafı çanağın altında gedir. Yetkin dişi fərdin çanağı dairəvi və ya oval formada olur, bədəninin uzunluğu 1,0-1,55 mm, çanağın diametri isə 1,7-2,8 mm olub, ağ və ya çirkli ağ rəngdədir, sanki 3 his-sədən ibarətdir.



**Şəkil 1.** Tut budağında tut çanaqlı yastıcasının dişi fərdləri



**Şəkil 3.** Tut çanaqlı yastıcasının yumurta qoyma prosesi



**Şəkil 2.** Tut budağında tut çanaqlı yastıcasının erkək fərdləri



**Şəkil 4.** Tut çanaqlı yastıcasının paraziti *Encarsia auranti*

Hərəkətsizdir, qanadsızdır, ayaqları və ğözü yoxdur, bığcıqları reduksiyaya uğrayıb. Bədənləri sarımtıl narıncı rəngdə olur. Erkəklərin çanağı uzunsov ağ rəngli olub, qalxanın baş hissəsində sürfə qabığı və uzununa 2 novşəkilli şırımı var. Yetkin erkəkin uzunluğu 0,5-1,0 mm olub, sarı rəngli və qanadlıdır. Tut çanaqlı yastıcasının fenologiyasını öyrəndikdə onların 3 nəsil verdiyi məlum olmuşdur. I nəslin inkişafı erkən yazda başlayır. Bu zaman yumurtalar dişi fərdin yumurta borularında inkişaf edir və mayın I-II ongünlüyündən etibarən yumurta qoymağa başlayırlar. Onların reproduksiyası zamanı yumurtalarında dixroizm müşahidə olunur. Açıq sarı rəngli yumurtalardan erkəklər, tünd narıncı rənglilərdən isə dişilər inkişaf edir. Yumurtadan çıxmış ”avara fərdlər” də həmin rənglərdə olurlar. Çanağın altında ya qarışıq, ya da eyni rəngli yumurtalara rast gəlmək olur.Yumurtaları qoyarkən zəncir kimi birbirinə yapışmış olurlar. Zəncirdə bəzən 10 və daha artıq yumurta bitişik ola bilir (Şəkil 3). Dişilər canağın altına 40-dan 170-ə qədər yumurta qoya bilirlər.

May ayında avara fərdlər çıxır. Avaraların çıxışı 2 həftə müddətində may ayında havanın orta temperaturu 14,5$^0$C olduqda baş verir. I yaş mərhələsinin sürfələri mayın sonunda qabığını dəyişərək ağacın zoğlarına yapışaraq ağ qalxanla örtülür və II yaş mərhələsinə keçirlər. Iyunun əvvəlində II yaş mərhələsindən yetkin dişilərə keçirlər. I nəslin erkəklərinin uçuşu 10 gün davam edir.

II nəslin erkəklərinin uçuşu iyulun sonu, avqustun əvvəlində baş verir. III nəslin uçuşu isə oktyabrda olur. Bu zaman həm II, həm də III nəslin erkəklərinə rast gəlinir. Orta günlük temperatur 6-11 $^0$C olduqda dişilər yumurta qoyurlar. İyunun II ongünlüyünün sonunda populyasiyada artıq cinsi yetkin dişilərə təsadüf olunur. II nəslin dişiləri avqustun sonundan sentyabrın əvvəlinə kimi davam edir. III nəslin cavan dişiləri oktyabrın əvvəlində və ortalarında görünürlər. Tut canaqlı yastıcasının təbii düşmənlərinin siyahısına 27 növ parazit və 20 növ yırtıcı həşərat daxildir (Константинова, 1990). Bunlardan ən effektlisi *Encarsia berlesai* sayılır. Bir sıra ölkələrdə zərərvericinin sayının azalmasında bioloji və inteqrir mübarizədə ondan istifadə edilir. Azərbaycanda tut çanaqlı yastıcasının say tənzimində *Aphytis proclia Walker, Encarsia aurantii* (Şəkil 4) və *Aspidiotiphagus citrinus* mühüm rol oynayır. *Aphytis proclia* polifaqdır, müxtəlif çanaqlı yastıcalarda parazitlik edir. *Aphytis proclia* xarici parazitdir, yumurtasını çanağın altındakı yastıcanın bədəninin üzərinə qoyur.

Yumurtadan çıxan sürfə yastıcanın bədəni ilə qidalanır, böyüyür və puplaşır. *Aphytis proclia* yumurta, sürfə və pup mərhələsində çanaqlı yastıca-nın dişi fərdinin içərisində qışlayır. Parazit sarımtıl rənglidir. I nəslin parazitləri mayda uçur (Şəkil 5). I nəslin tam inkişafı 30-35 gündür. İldə 4-5 nəsil verir.

Digər növlər- *Encarsia aurantii* və *Aspidiotiphagus citrinus* endoparazitdirlər, yastıcanın bədəni daxilində inkişaf edir. *Encarsia aurantii* az saylıdır, tut çanaqlı yastıcasının say tənzimində rolu azdır.



**Şəkil 5.** Parazitin tut çanaqlı yastıcasının çanağında açdığı uçus dəliyi.



**Şəkil 6.** *Ch. bipustulatus* böcəyi

Abşeron yarımadasında tut bitkisində tut çanaqlı yastıcasının sayının tənzimlənməsində xilokorus böcəyinin mühüm əhəmiyyəti vardır. *Chilocorus bipustulatus L.* (Linnaeus, 1758) faydalı növ olub, Avropada, Rusiyanın Avropa hissəsinin cənubunda, Sibirdə, Qafqazda, Orta Asiyada, Baykalyanı ərazilərdə, Monqolustanda geniş yayılmışdır (Şəkil 6). Meşə və parklarda,işıqlı bağçalarda rast gəlinir. *Chilocorus bipustulatus* parabüzəni yastıcaların, ağqanadlının yırtıcısı kimi qeyd olunmuşdur. Abşeronda geniş yayılmışdır. Yalnız ağaclarda müşahidə olunur. May ayından oktyabr ayına kimi həm imaqo, həm də sürfələrinə rast gəlmək olur.

Əsas qidasını *Diaspididae* fəsiləsinin yastıcaları təşkil edir. Qida azlığı olduqda yalançı çanaqlı yastıcaları, o çümlədən avstraliya şırımlı yastıca ilə qidalanırlar. Həm sürfələri və həm də yaşlı fərdləri çox acgözdür. Qidasını sona qədər sürətlə yeyirlər. Bu böcəklər özünəməxsus qaramtıl qırmızı rəngdə olub, başı açıq rəngli, döş, qarıncıq və ayaqları qırmızıdır. Soyuğa davamlı deyillər. Bədənin uzunluğu 3-5 mm olub, bığcıqları 8 buğumludur. Xilokorus böcəyi Abşeronda 2 nəsildə inkişaf edir. Birinci nəsil iyun ayının sonunda, 2 nəsil sentyabrın əvvəlində başa çatır. Yetkin mərhələdə ağacların gövdəsində olan çatlarda, budaqların qoltuq hissəsində, kökətrafı torpaq çatlarının günəş düşən yerlərində qışlayırlar.



**Şəkil 7.** *Ch. bipustulatus* böcəyinin topa halında qoyulmuş yumurtaları



**Şəkil 8.** *Ch. bipustulatus* böcəyinin II yaş sürfəsi

Qışlamanı keçirən böcəklər havanın temperaturun dan asılı olaraq martın sonu, aprelin əvvəlində yastıcalarla yoluxmuş ağacların üzərində müşahidə olunurlar. 2-3 həftə ərzində cütləşmə prosesi gedir. Bir xilokorus gün ərzində 25-30,bir ay müddətində isə 300-500 tut çnaqlı yastıcası ilə qidalanır. Bunun da ¾ hissəsini dişi yastıcalar təşkil edır (Şəkil 6). Mayın I-II ongünlüyündə canaqlı yastıca çanaqlarının yanına, boş çanaqların altına, ağac qabıqlarının çatlarına tək-tək və ya topa halında (3-5 ədəd), əlverişli yerlər olduqda hətta 10-15 ədəd yumurta qoyurlar. Laboratoriya şəraitində kartof üzərində artırlmış xilokorusların kartofun gözcüyündə topa halında 15-ədək yumurta qoymağı qeydə alınmışdır (Şəkil 7).

Orta hesabla dişilərin nəsilvermə qabiliyyəti 120-130 yumurtaya çatır. Narıncı rəngli yumurtalar sürfələr çıxmazdan əvvəl tündləşirlər. 5-8 gündən sonra yumurtalardan 0,1 mm uzunluğu, üzərində qılcıqları olan qaramtıl rəngli sürfələr çıxır.Sürfənin birinci qarın seqmenti isə ağ rənglidir (Şəkil 8 və 9).

Sürfələr 4 yaş mərhələsi keçirərək, 3 dəfə qabıq dəyişirlər. Qabıq dəyişmədən əvvəl bədəninin arxa hissəsi ilə substrata yapışırlar. I yaşlı sürfələrin

3-4 günlük inkişafından sonra I qabıqdəyişmə baş verir və II yaşlı sürfələrə çevrilir lər. Bu sürfələr sarımtıl rəngli olub, nisbətən iridirlər. 3-4 gündən sonra yenidən qabıqdəyişmə baş verir.



**Şəkil 9.** *Ch. bipustulatus* böcəyi dişi yastıca ilə qidalanarkən



**Şəkil 10.** *Ch. bipustulatus* böcəyinin pup mərhələsi

IV yaşlı sürfələr təxminən 6-8 gün aktiv qidalandıqdan sonra sükut halına keçir və pupönü mərhələ başlayır. 2-3 gün bu vəziyyətdə qalan sürfələr həmin yerə yapışaraq pup halına keçirlər (Şəkil 10).

Puplaşmadan öncə bir yarpaqda bir neçə sürfə olmaqla qruplaşırlar. Sürfə mərhələsi 12-14 gün davam edir. Pup mərhələsi 6-8 gün çəkir və pupdan yetkin fərdlər çıxır. Pupdan çıxmış fərdlər (imaqo) əvvəlcə açıq rəngli olub passivdirlər. 2-3 gündən sonra aktivləşirlər. Havanın temperaturu $35^0$C-dən çox olduqda xilokoruslara az təsadüf olunur.

Onlar yarpaqların arasında, ağacların qabığı altında diapauzaya gedirlər. *Ch.bipustulatus* tut çanaqlı yastıcasının sürfələrinə nisbətən II və III yaş mərhələsində olan yastıcalara üstünlük verir, yastıcaların sayı azaldıqda isə digər yoluxmuş ağaclara keçirlər.

## ƏDƏBİYYAT


**Борхсениус Н.С.** (1963) Щитовки рода Contigaspis MacGilivray (Homoptera, Coccoidae) всесветной фауны. Н.С.Борхсениус, Д. Дж. Вильяме.Энтомол. обозрение, **42(3):** 594-610.

**İsmayılova G.Ə. və b.** (2008) Tut çanaqlı yastıcasının (*Pseudaulacaspis pentagona*) bioekoloji xüsusiyyətləri haqqında. Bakı: "Elm", **251-255.**

**Mustafayeva G.Ə.** (2003) Lənkəran zonasında qorxulu bitki zərərvericisi olan tut çanaqlı yastıcası (*Pseudaulacaspis pentagona Targ-Tozetti)* və onun entomofaqları. Ekologiya, fəls.məd. məqalələr toplusu, Bakı, **92-95**.

**Константинова Г.М. (**1990) Щитовки, **42-66.**


### Паразиты и Хищники Тутовой Щитовки (*Pseudaulacaspis Pentagona* (Targ-Toz.) – Вредителя Шелковицы на Апшероне


**Г.А. Исмаилова**

*Институт зоологии НАНА*



В статье приведены сведения об опасном вредителе шелковицы – тутовой щитовке *Pseudaulacaspis pentagona (Targ-Toz.*), а также *о* паразитах и хищниках, принимающих участие в ее биорегуляции. Установлено, что наиболее эффективными в биорегуляции численности этого вредителя являются божья коровка *Chilocorus bipustulatus L.* и паразит *Encarsia auranti* (*Chalcididae*). С целью их использования в борьбе с тутовой щитовкой, были изучены их биоэкологические особенности, хозяйственное значение и распространение.



***Açar sözlər:*** *тутовое дерево,вредитель, щитовка, паразит, жук, биологическая борьба*

**Parasites and Predators of Mulberry Pest *Homoptera, Pseudaulacaspis Pentagona* (Targ-Toz.) In Absheron**

**G.A.Ismayilova**

*Institute of Zoology, ANAS*

Information on *Pseudaulacaspis pentagona (Targ-Toz.)* causing serious harm to Mulberry trees, parasites and predators involved in its bioregulation has been presented in the paper. Predator *Coccinellidae* (*Chilocorus bipustulatus L.)* and parasite *Encarsia auranti* (*Chalcididae*) appeared to be more effective in bioregulation of this pest's number. For biological control over this pest its bioecological properties, economic importance and distribution were studied.

***Key words:*** *Mulberry tree, pest, Pseudaulacaspis pentagona, parasite, bug, biological control*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 49-52 (2014)*

# Quba-Xaçmaz Bölgəsində Meşə və Kənd Təsərrüfatı Bitkilərinə Zərərverən Başlıca Yarpaqyeyən Böcəklər (*Coleoptera, Chrysomelidae*) və Onların Təbii Düşmənləri

**G.İ. Nadirova**

*AMEA Zoologiya İnstitutu, A.Abasov küç., 1128 döngə, Bakı AZ1073, Azərbaycan*

**Quba-Xaçmaz bölgəsində meşə və kənd təsərrüfatı bitkilərinə zərər verən 6 növ yarpaqyeyən böcəyin (*Oulema melanopus* L., *Colaphellus sophiae* hoefti Men., *Plagiodera verzicolora* Laich., *Luperus xanthopoda* Schrnk., *Chrusomela vigintipunctata* Sckop., *Lochmaea crataegi* Forst.) bioekoloji xüsusiyyətləri, təsərrüfat əhəmiyyəti və Azərbaycanda ilk dəfə olaraq onların təbii düşmənləri haqda məlumatlar verilir.**

***Açar sözlər***: *zərərverici, entomofaq, parazit, yırtıcı, biosenoz*

## GİRİŞ

Muasir elmi-texniki tərəqqi dövründə, Quba-Xaçmaz bölgəsinin ekoloji şəraitini nəzərə almaqla, meşə və kənd təsərrüfatının daha da inkişaf etdirilməsi, fauna və floranın kompleks mühafizəsi, onlardan səmərəli istifadə edilməsi, başlıca vəzifə kimi qarşıda duran məsələlərdən biridir. Bölgənin özünəməxsus iqlim şəraiti, meşələrinin rəngarəng bitki örtüyü və torpaq tipi, burada entomofaunanın zənginləşməsinə, o cümlədən zərərverici həşəratların artıb-çoxalmasına, geniş imkan yaradır. Bu baxımdan zərərverici həşəratlar qrupuna daxil olan yarpaqyeyən böcəklərin öyrənilməsi və onlara qarşı mübarizə tədbirlərinin həyata keçirilməsi günün ən vacib məsələlərindəndir.

Yarpaqyeyən böcəklər bioloji və ekoloji xüsusiyyətlərinə görə bir birindən fərqlənən növlər olub, kənd təsərrüfatı bitkilərinə və meşə ağaclarına daha çox zərər verirlər.

Azərbaycanda yarpaqyeyən böcəklərin öyrənilməsinə XX əsrin əvvəllərində başlanmışdır. Bu istiqamətdə respublika alimləri (Самедов, 1963; Mirzəyeva, 1988) ilə yanaşı başqa xarici alimlər də (Radde, 1889; Оглобин, 1936) ara-sıra tədqiqatlar aparmışlar.

## MATERİAL VƏ METODLAR

Materialların toplanması və işlənməsi (2011-2013-cü illərdə) entomologiyada qəbul edilmiş ümumi üsullar vasitəsilə (Оглобин, 1936; Самедов, 1963; Mirzəyeva, 1988) çöl və laboratoriya şəraitində həyata keçirilmişdir. Stasionar məntəqələr kimi Quba, Qusar, Xaçmaz və Şabran rayonları seçilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Aparılan tədqiqatlara əsasən Quba-Xaçmaz bölgəsində meşə və kənd təsərrüfatı bitkilərinə zərər verən 6 növ yarpaqyeyən böcək və onların təbii düşmənləri haqqında məlumat verilir.

1. *Oulema melanopus L.* - Zəlicə.

Böcəklər arasında Zəlicə bitkilərə vurduğu zərərə görə əsas yerlərdən birini tutur. Yumurtaları uzunsov, kəhraba rəngli, üç cüt ayağı olan sürfələri isə açıq-sarı rənglidir. Onlar yumurtadan çıxan kimi boz-sarı seliklə örtülür. Selik onları xarici təsirlərdən və yırtıcılardan qoruyur. Puplar ağ rəngdə olub küp formasında olan baramaların daxilində inkişaf edirlər. Bir çox həşəratlar kimi zəlicə də öz inkişafının müəyyən mərhələsini (imaqo) diapauza mərhələsində keçirir.

Böcəklər yazda çox tez oyanırlar. Havanın temperaturu müsbət 12-13 dərəcə olanda onlar qışlama yerlərindən çıxaraq, taxıl bitkilərinin yarpağı və zoğları üzərində qidalanmağa başlayırlar. Payızlıq buğda və arpa sortlarına nisbətən, yulaf və qarğıdalı bitkilərinə daha çox zərər verirlər.

Böcəklər 5-6 gündən sonra, yəni aprelin birinci və ikinci ongünlüyündə kütləvi surətdə mayalanaraq yumurta qoyma prosesinə başlayırlar. Yumurtaqoyma prosesi may ayının axırına qədər davam edir (Şabran 27 may 2012-ci il). Zəlicə orta hesabla öz inkişafı dövründə 70-150, bəzi hallarda isə 200-dən artıq yumurta qoya bilir. Onlar taxıl yarpaqının alt tərəfinə hər sıraya zəncirvari formada 5-8 ədəd yumurta qoyur. Yumurtaların inkişafı 10-12 gün davam edir. Yumurtadan çıxan sürfələr taxıl yarpaqları ilə qidalanırlar. 12-15 gündən sonra onlar axırıncı qabıqdəyişmə mərhələsini keçirlər. Beləliklə, zəlicələr 4 dəfə qabıq dəyişirlər. Puplaşma torpağın 4-6 mm dərinliyində 15 gün davam edir.

İyun ayının birinci yarısında yeni nəslin fərdlərinə rast gəlmək olur. Yeni nəslin fərdləri yabanı

taxıl bitkilərinin üzərində qidalanırlar. Quba-Xaçmaz bölgəsində ildə 1-2 nəsil verir.

Taxıl sahələrində zəlicənin sayının tənzimlənməsində 10 növ (*Bracon fumipennis* Thoms., *Eulophus chrysomelae* Hees., *Trichogramma evanescens* West., *Calosoma sycophanta* L., *Staphylinus olens* Mull., *Adonia variedata* Gz., *Semiadalia notata* L., *Coccinella quatuordecimpunctata* L., *Chrysopa carnea* L., *Yalla dumosa* F.) parazit və yırtıcı iştirak edir.

2. *Colaphellus hoelti* Men - Şərqxardal yarpaqyeyəni.

Mezokserofil növdür. Şərqxardal yarpaqyeyəninin həyat tərzi digər yarpaqyeyənlərin həyat tərzindən elə də fərqlənmir. Bədəni 5-6 mm, qabarıq formadadır. Onların inkişafı ilk əvvəl yabanı xaççiçəklilər üzərində, sonra isə mədəni bitkilər (qarabaşaq, kələm, turp, qıtıqotu və çuğundur) üzərində başa çatır. Bitkilərə əsasən may-iyun aylarında zərər vurur. Bəzən zərərvermə dərəcəsi 40-50%-ə çatır.

Yarpaqyeyənin bioekoloji xüsusiyyətləri Quba, Qusar və Şabran rayonlarında öyrənilmişdir. Yaz və yay aylarında (22.III.2011, 15.IV.2012, 20.V.2013) havanın orta günlük temperaturu 20-25$^0$C olduqda, böcəklər torpaqdan çıxmağa başlayırlar. Qışlamadan çıxan böcəklər sürətlə qidalanırlar.

Qışlama yerlərindən çıxdıqdan sonra onlar yabanı və mədəni bitki növlərinin yarpaqlarını yeyərək onları skeletləşdirirlər. Böcəklərə toxunan kimi yerə düşüb özlərini ölülüyə vururlar. Onlar qida bitkilərinə yaxın yerlərdə uçurlar. Qidalanmadan 6-8 gün sonra, yəni may ayının əvvəllərində cütləşirlər. Mayalanma 10-15 gün davam edir. Dişilər yumurtanı bitkinin kökünə yaxın torpağa, bəzən isə yarpağın alt hissəsinə, ya da torpağın üst hissəsində qoyurlar. Onların kütləvi yumurta qoyması isə may ayının əvvəllərində müşahidə edilmişdir. Yumurtalar 15-20 ədəd olmaqla topa halında qoyulur. Müşahidələr nəticəsində aşkar olunmuşdur ki, qoyulan yumurtaların hamısından sürfə çıxır. Belə ki, çıxan sürfələrin sayı 8-10 fərdə çatır.

Laboratoriya şəraitində, yumurtaların embrional inkişafı, orta günlük temperatur 15-16$^0$C olduqda 12-14 gün davam edir. Təbiətdə isə 23-25$^0$C-də yumurtaların inkişafı 6-10 gün çəkir. 28-30$^0$C isti müşahidə olursa yumurtalar cəmi 3-4 günə inkişaf edir. Eləcə də, müəyyən olunmuşdur ki, temperatur 34-36$^0$C-dən yuxarı olanda yumurtalar tamamilə məhv olurlar. Şərqxardal yarpaqyeyəni 100-dən 300-ə qədər yumurta qoya bilir. Yumurtadan çıxan sürfələr inkişaf edərkən 3 yaş mərhələsi keçirlər. 6-8 gündən sonra axırıncı mərhələdə bitkini tərk edir, torpağa düşür və puplaşırlar. Təbiətdə havanın orta günlük temperaturu 20-23$^0$C olduqda puplar 7-10 günə inkişaf edirlər. Yeni nəslin çıxması iyun ayının birinci ongünlüyündə başlayır. Sentyabr ayının axırında böcəklər xəzəllərin altında, bəzən də torpaqda qışlayırlar. İldə 1-2 nəsil verir. Tədqiqatlar nəticəsində müəyyən edilmişdir ki, zərərvericinin sayının azalmasında taxin milçəklərinin və ixnevmonid minicilərinin rolu vardır. Rusiya alimlərinin (Бронштейн, 1991) məlumatlarına görə bu zərərvericiyə qarşı işlənilən karate kimyəvi preparatı zərərvericinin sayını 97-100% aşağı salır.

3. *Plagiodera versicolora* Laich. - Abı rəngli söyüd yarpaqyeyəni.

Qiqrofil növdür. Bu cinsə 100 növ daxildir. Onlar, yer kürəsinin hər yerində yayılmışdır. Azərbaycanda 1 növü qeydə alınmışdır. Başqa növlərdən o qədər də fərqlənmir. Bədəni 6-7 mm, qabarıq, qanadlıdır, parlaq abı rəngdədir. Cavan sürfələrin baş hissəsi parlaq-qara, bədənləri yaşıl-qəhvəyi rəngində, son mərhələnin sürfələri isə qara, göy-yaşıl rəngdədir. Sürfənin uzunluğu 8-10 mm-dir. Yumurtalar parlaq-sarı rəngdə olmaqla oval formadadırlar. Puplar isə açıq-sarı, yumşaq və çox zərifdirlər.

Abı rəngli söyüd yarpaqyeyəni Quba-Xaçmaz bölgəsinin bütün rayonlarında yayılmışdır. Ona, meşə senozlarında tez-tez rast gəlinir. Böcəklər ağacların qabığı altında ya da çatlarında qışlayırlar. Təbiətdə havanın temperaturu 15-20$^0$C olduqda qışlama yerlərindən çıxırlar. Böcəklər çıxan kimi ağacların (söyüd, qovaq) cavan yarpaqlarılə qidalanırlar (Бровидин, 1977). Nəticədə yarpaqların üzərində müxtəlif formalı deşiklər əmələ gətirirlər. Qidalanmadan 10-15 gün sonra yetkin fərdlər cütləşib cavan və zədələnmiş yarpaqların alt hissəsində topa halında yumurta qoymağa başlayırlar. Dişilərin reproduktiv imkanı çox güclüdür. Dişi fərd təbii şəraitdə hər dəfə 50-dən 80-ə qədər yumurta qoya bilir.

Laboratoriyada aparılan müşahidələrə əsasən bir dişi fərd 280-350-ə qədər yumurta qoyur, hər topada 25-45-ə qədər yumurta olur. Bu proses may ayının ikinci ongünlüyünə kimi davam edir. (Xızı, 20.V.2012). Yumurtaların inkişafı iqlim şəraitindən asılıdır. Yumurta qoyulduqdan 4-8 gün sonra sürfələr çıxır və qidalanmağa başlayırlar. Əvvəlcə onlar topa halında yarpağı skeletləşdirir, sonra isə digər yarpağa keçib tək-tək qidalanmağa başlayırlar. Bu cür güclü qidalanmadan sonra yarpaqlar burulur, quruyub tökülürlər. Sürfələr 5-6 gündən sonra qabıq dəyiş-məyə başlayırlar, 8-10 gün keçdikdən sonra ikinci qabıqdəyişmə başlayır. 2 həftədən sonra isə sürfələr 3-cü yaşa çatırlar. Puplaşmadan 3-4 gün əvvəl sürfələr qabıqlarını atıb torpağın üzərinə düşürlər və qida bitkisinin altında 5-6 sm dərinliyə gedib puplaşırlar. Sürfənin inkişafı 14-16 gün davam edir. Pup dövrü isə 4-6 gündür. Bir nəslin inkişaf dövrü 20-25 gün çəkir, bəzən 30 gün davam edir. May ayının axırı iyun ayının əvvəlində yeni nəslin böcəkləri görünməyə başlayırlar.

Müşahidələrə əsasən, böcəklərin kütləvi çıxışı may-iyun aylarında baş verir və bu zaman ağaclara ciddi ziyan dəyir (təxminən 35-40%), ildə iki nəsil verir.

Abı rəngli söyüd yarpaqyeyənin təbii düşmənlərindən hörümçəyi, taxin milçəyini, xalsidləri, cır arıları və karabid böcəyini göstərmək olar.

4. *Luperus xanthopoda Schrnk* - Sarıayaq yarpaqyeyəni.

Böcək aprel ayının II-ci yarısında bölgənin bütün rayonlarında qeydə alınmışdır. Onlar meşə, park və bağların kənarlarında yaşayırlar. Polifaq növdür. Biz tərəfdən Qusar rayonunun Digəh kəndində (10.IV.2012-22.VI.2013) müşahidə aparılmışdır. Bədəninin üstü şəffaf qara, ayaqları sarı rəngdədir, uzunluğu 4-6 mm-dir. Onlar qarağac, göyəm, yemişan, zoğal, ərik, şaftalı, heyva və başqa ağacların yarpaqlarında (damar hissəyə toxunmadan) iri deşiklər açırlar. Bu böcəklər göyəm, gavalı və alça ağaclarına daha çox zərər vururlar. Onlar təkcə yarpaqları deyil, eyni zamanda meyvələri də zədələyirlər. İntensiv qidalanma ilə əlaqədar olaraq tezliklə cütləşib yumurta qoymağa başlayırlar. Yumurtaları topa halında (hər topada 10-35 ədəd yumurta olur) torpağın səthindəki çatlara qoyurlar. Hər bir dişi fərd 150-250 yumurta qoyur, bəzən də 300-ə qədər olur. Yumurtadan çıxan sürfələr ot bitkilərinin kökləri üzərində inkişaf edirlər. Sarıayaq yarpaqyeyənin sayının tənzimlənməsində parazit və yırtıcıların rolu böyükdür. Beləliklə, onları 7 növ parazit və yırtıcı məhv edir, bunlar: *Tetrastichus sp., Bethylus sp., Meygenia mutabilis* Fall., *Staphylimus olens* Mull., *Semiadalia notata* L., *Chrysopa septempunctata* Wesm., *Ch. perla* L. (Мамедов, 2004).

5. *Chrysomela vigintipunctata Scop.* - 20 nöqtəli yarpaqyeyən.

20 nöqtəli yarpaqyeyən çayların, kanalların sahillərində rütubətli yerlərdə yaşayır.

Böcəklərin öyrənilməsinə dair müşahidələr Xaçmaz rayonunda (12.IV.2011-22.VII.2013) aparılmışdır. Böcəklər yaşlı mərhələdə dayaz torpaqda və yarpaqların altında qışlayırlar. Onlar qışlamadan aprel ayının ortasında, ya da axırında çıxırlar. Qovaq ağaclarının cavan yarpaqları ilə qidalanır, sonra isə müxtəlif növ söyüd ağaclarına keçirlər. Qışlamadan çıxandan 7-10 gün sonra böcəklər cütləşməyə və yumurta qoymağa başlayırlar. Yumurtalarını yarpaqların aşağı hissəsinə topa halında qoyurlar. Hər bir topada 30-35, bəzən 50-dən çox yumurta olur. Bir dişi fərd yaşadığı dövrdə 300-350-ə qədər yumurta qoya bilir. Yumurtalardan çıxan sürfələr yarpaqlarla qidalanır, onları skelet halına salırlar. 4-6 gündən sonra onlar üç dəfə qabıqlarını dəyişirlər. Son qabıqdəyişmənin axırında sürfələr qarınlarının arxa hissəsindən yarpağa birləşir, başı aşağı sallanaraq puplaşma mərhələsini keçirirlər. Yaşlı sürfələr çox vaxt ağaclardan yerə düşərək müxtəlif ot bitkiləri üzərində puplaşırlar. Puplaşma mərhələsi 5-8 gün arasında davam edir. May ayının axırı və iyunun əvvəlində puplardan böcəklərin yeni nəsli çıxır. Cavan böcəklər yem bitkiləri üzərində qidalanırlar. Əlverişli şəraitdə cavan böcəklər yumurta qoymağa başlayır və tez bir müddətdə yeni nəsil əmələ gəlir. İldə 1-2 nəsil verir. 20 nöqtəli yarpaqyeyənin bir neçə parazit və yırtıcıları (*Bracon fumipennis Thoms., Tetrastichus evonymelae L., Carabus auratus L., Holysia sedecimpunctata L., Orius minutus L., Pieromerus bidens L., Formica rufa F.*) aşkar edilmişdir. Onlar bu zərərvericinin sayının tənzimlənməsində mühüm rol oynayırlar. Qovaq və söyüd ağaclarına daha çox zərər verir.

6. *Lochmaea crataegi Forst.* - Yemişan yarpaqyeyəni.

Yemişan yarpaqyeyəni yetkin formada qışlayır. Müşahidələr Şabran rayonunda (06.IV.2012-23.VII.2013) aparılmışdır. Aprel ayının ortalarında böcəklər qışlama yerlərindən uçub meyvə bağlarına gəlirlər, yeni əmələ gəlmiş tumurcuqlar, yarpaqlar və qönçələrlə qidalanırlar. 7-8 gün keçəndən sonra mayalanaraq yumurta qoymaqa başlayırlar. 10-15 gündən sonra çıxan sürfələr cavan meyvələrin daxilinə girirlər. Burada onlar 30 gün qidalandıqdan sonra meyvənin içindən çıxırlar və torpağa düşüb 5-6 sm dərinliyində puplaşırlar. Pupların inkişafı 14-15 gün davam edir. Yeni nəsil avqust ayının əvvəlində çıxıb meyvə ağaclarının (alça, zoğal, alma) yarpaqları ilə qidalanıb qışlamaya gedirlər. İldə 1 nəsil verir.

Böcəklərin sayını tənzimləyən bir neçə növ entomofaq (*Bracon guttiger* Wesm., *Eulophus sp., Tetrastichus asparagi* Grav., *Trichogramma evanescens* West., *Vespula germanica* Fab., *Carabus auratus* L., *Calosoma sycophanta* L., *Adonia variegata* Gz.), aşkar edilmişdir.

## ƏDƏBIYYAT


**Mirzəyeva N.B.** (1988) Azərbaycanın yarpaq-yeyən böcəkləri. 5 cild, Bakı: "Elm", 209 c.

**Бровдий В.М.** (1977) Фауна Украины (*Chrysomelini*), Киев, 347 с.

**Броншгейн Ц.Г.** (1991) Материалы по фауне и биологии жуков-листоедов Зеровшанской долины. Тр. Самаркандского У-та, **100**: 3-65.

**Мамедов З.М.** (2004) Паразиты вредных чешуекрылых плодовых культур Азербайджана и пути их использования в биологической защите. Баку: «Элм», 233 с.

**Оглобин Д.А.** (1936) Листоеды *Galerucinae*. Фауна СССР (Насекомые жесткокрылые). М.Л., **XXVI (1)**: 455.

**Самедов Н.Г.** (1963) Фауна и биология жуков, вредящих с/х культурам в Азербайджане. Изд. АН Азерб. ССР: 102-103.

**Radde G.Z.** (1899) Коллекция Кавказского музея, обработанные совместно с учёными специалистами Museum Caucasicum Zoologiya, Tiflis, **1**: 43-51.

### Основные Вредители Лесных и Сельскохозяйственных Культур и Их Естественные Враги в Условиях Куба-Хачмазской Зоны Азербайджана

**Г.И. Надирова**

*Институт зоологии НАНА*

В статье представлена информация относительно биоэкологических особенностей и хозяйственного значения 6 видов жуков-листоедов (*Oulema melanopus* L., *Colaphellus sophiae* hoefti Men., *Plagiodera verzicolora* Laich., *Luperus xanthopoda* Schrnk., *Chrusomela vigintipunctata* Sckop., *Lochmaea crataegi* Forst.) – вредителей лесных и сельско-хозяйственных растений в Куба-Хачмазской области. Впервые сообщается об их естественных врагах в Азербайджане.

***Ключевые слова***: *вредитель, энтомофаг, паразит, хищник, биоценоз*

### Main Pests (*Coleoptera, Chrysomelidae*) Of Forest And Agricultural Plants And Their Natural Enemies In The Guba-Khachmaz Zone Of Azerbaijan

**G.I. Nadirova**

*Institute of Zoology, ANAS*

Information has been presented on bioecological features, economic importance of six pests (*Oulema melanopus* L., *Colaphellus sophiae* hoefti Men., *Plagiodera verzicolora* Laich., *Luperus xanthopoda* Schrnk., *Chrusomela vigintipunctata* Sckop., *Lochmaea crataegi* Forst.) in Guba- Khachmaz Zone and their natural enemies have been identified for the first time in Azerbaijan.

***Key words****: pest, entomofag, parasite, predator, biocenosis*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 53-59 (2014)

# Halofil Bakteriyalarda Hüceyrəxarici Lipaza və Amilaza Fermentlərinin Sintezi

**Y.Y. Atakişiyeva*, K.X. İsayeva, İ.M. İmanova, Ş.Ə. Feyzullayeva**

*AMEA Mikrobiologiya İnstitutu, Badamdar şossesi, 40, Bakı AZ1073, Azərbaycan;*
**E-mail: y.atakishiyeva@mail.ru*

**Azərbaycanda Abşeron yarımadasının şoran torpaq və duz göllərindən götürülmüş nümunələrdən 9 halofil və halotolerant bakteriya ştamı ayrılmışdır. Morfoloji, fizioloji və biokimyəvi xüsusiyyətlərinə əsaslanaraq altı ştam *Halomonas* cinsinin, iki ştam *Halococcus* cinsinin və biri *Bacillus cereus* növünün nümayəndəsi kimi identifikasiya edilmişdir. Bakteriya ştamlarının hüceyrəxarici lipaza və amilaza aktivliyi öyrənilmişdir. *Bacillus cereus St9* potensial amilaza, *Halomonas St3* isə lipaza produsenti kimi seçilmişdir. *Bacillus cereus St9*-un hüceyrəxarici amilaza aktivliyi üçün uyğun şərait 50°C, pH 7,0, 0,5–1,5% NaCl; *Halomonas St 3*–ün kultura mayesinin maksimal lipaza aktivliyi üçün optimal şərait 60°C, pH 9,0 və reaksiya mühitinə əlavə edilən NaCl-un qatılığı 10% olmuşdur.**

***Acar sözlər:*** *halofil bakteriyalar, hüceyrəxarici aktivlik, lipaza, amilaza*

## GİRİŞ

Böyük bir qrup təşkil edən halofil orqanizmlərə çoxalma və sağ qalma üçün mühitdə yüksək qatılıqda qeyri-üzvi duzlar, əsasən natrium xlorid duzu tələb edən birhüceyrəli heyvan, yosun və bakteriyalar daxildir. Fizioloji və qidalanma xüsusiyyətləri ilə fərqlənən halofil bakteriyalar müxtəlif filogenetik qruplara daxil edilir. Məs., *Actinobacteria* tipinə aid *Actinomycetales* sırası, *Bacteroidetes* tipindən olan *Sphingobacteriales* sırası, *Firmicutes* tipinə aid *Bacillales, Halanaerobiales* və *Natranaerobiales*; yarımtip *Proteobacteria* –dan olan *Rhodospirillales* və *Rhizobiales,* yarımtip *Proteobacteria* olan *Chromatiales, Oceanospirillales* və *Pseudomonadales*. Bu mikroorqanizmlər arasında yalnız üçü - *Halorhodospira halochloris, Halanaerobium lacusrosei* və *Natranaerobius 'grantii'* nisbətən geniş öyrənilmişdir. Göstərilmişdir ki, qeyd edilən mikroorqanizmlərin duza davamlılığı mühitin tərkibi, reaksiyası və becərilmə temperaturundan asılıdır (Bowers et al., 2008; Cayol et al., 1995; Imhoff and Trüper, 1977).

Halofil bakteriyaların ən mühüm biotexnoloji tətbiq sahələri müxtəlif hüceyrəxarici fermentlər sintez etməsi ilə əlaqədardır (Moreno et al., 2013). Bu fermentlərin tibbi-bioloji elm sahələrində və kimya sənayesində böyük tətbiq potensialı var. Onlar nəinki duza davamlılığı, həmçinin yuxarı temperatur və pH göstəricilərində də yüksək fəallığı ilə fərqlənir. Məhz bu səbəbdən son zamanlar halofil mikroorqanizmlərdə hüceyrəxarici hidrolitik fermentlərin sintezi diqqət mərkəzinə çevrilmişdir.

Sanchez-Porro və b. (2003), Rohban və b. (2009) hüceyrəxarici hidrolitik fermentlər sintez edən halofil bakteriyaların skrininqini aparmış və orta dərəcədə halofil bakteriyaların amilaza, dezoksiribonukleaza, lipaza, proteaza və s. Hüceyrəxarici hidrolitik fermentlərin potensial mənbəyi olduğunu göstərmişlər. Hidrolaza sintez edən duzlu mühitə adaptasiya olunmuş termotolerant bakteriyalar, nukleaza sintez edən *Bacillus* sp., proteaza sintez edən *Micrococcus varians*, lipaza sintez edən ekstrem halokokkus *Natronococcus sp*., amilaza sintez edən *Micrococcus sp*. və ksilanaza sintez edən ekstremal halofil arxebakteriya *Halorhabdus utahensis* geniş tədqiq edilmişdir (Mathabatha, 2010).

Təqdim olunan işin məqsədi təbii mənbələrdən halofil mikroorqanizmlərin ayrılması, hüceyrəxarici amilaza və lipaza produsentlərinin skrininqi olmuşdur.

## MATERİAL VƏ METODLAR

Tədqiqat obyekti Abşeron yarımadasının duzlu gölməçələri və şoran torpaqlarından ayrılmış müxtəlif mikroorqanizmlər olmuşdur. Nümunələr su hövzəsindən 0,5 m və torpaq səthindən 0,2 m dərinlikdən aseptik olaraq götürülmüşdür. Əkindən əvvəl torpaq nümunələri xırdalanmışdır. Torpaq nümunələrinin suspenziyası müxtəlif dərəcədə durulaşdırılmış və NaCl əlavə edilmiş MH (Mueller-Hinton) mühitinə (Ventosa et al., 1989) əkilmişdir. Fərqli morfoloji quruluşu olan bakteriya koloniyaları içində çəp şəkildə eyni mühit olan sınaq şüşələrinə keçirilmişdir. MH mühitinin tərkibinə (q/l): maya ekstraktı - 10; proteaza peptonu - 5; qlükoza - 1; NaCl - 100; $MgCl_2{\cdot}6H_2O$ - 7; $MgSO_4{\cdot}7H_2O$ - 9,6; $CaCl_2{\cdot}2H_2O$ - 0,36; KCl - 2; $NaHCO_3$ - 0,06 və NaBr - 0,026 daxildir. pH 7,2-dir.

***Ayrılmış ştamların xarakteristikası.*** Seçilmiş bakteriya ştamlarının morfoloji, fizioloji və biokimyəvi xüsusiyyətləri müxtəlif standart metodlarla təyin edilmişdir: qrama görə, hərəkətliliyi, koloniyanın rəngi, IMViC testləri (Ventosa et al., 1989). Optimal böyümə temperaturu və pH, NaCl-a tolerantlıq adi üsullarla müəyyənləşdirilmişdir. Müxtəlif karbohidratların (1,0%) fermentasiyası karbohidrat əlavə edilmiş mühitdə fenol qırmızı məhlulu ilə yoxlanılmışdır. Antibiotiklərin ingibitor təsiri antibiotik çökdürülmüş disklərdən istifadə etməklə təyin edilmiş və antibiotk indeksi ilə (rezistentlik göstərilən antibiotiklərin sayının yoxlanılan antibiotiklərin sayına nisbəti) ifadə edilmişdir.

***Hüceyrəxarici ferment sintez edən bakteriyaların seçilməsi.*** Hüceyrəxarici lipaza və amilaza sintez edən mikroorqanizmlərin skrininqi üçün ayrılmış halofil bakteriyalar aqarlaşdırılmış və uyğun substratlar əlavə edilən mühitə əkilmişdir. Kulturaların amilaza fəaliyyətini təyin etmək üçün bir litrində 10,0 q nişasta olan mühitdən istifadə edilmişdir. Mühitin turşluluq göstəricisi eksperimentin şərtlərindən asılı olaraq 7,0 - 10,0 arasında olmuşdur. İnkubasiya 30ºC-də 72 saat aparılmış, sonra üzərinə yod məhlulu tökülmüşdür. Bakteriya ştamlarının lipaza fəaliyyəti 1,0% tributirin əlavə edilmiş aqarlaşdırılmış qida mühitlərində (Petri kasalarında) təyin edilmişdir. Bu təyinatda tributirinin hidrolizi nəticəsində koloniyaların ətrafında yaranan şəffaf zonalar lipaza aktivliyini aşkar edir.

Potensial ştamlar yaranmış təmiz zonaların diametrinin koloniyanın diametrinə olan nisbətə əsasən seçilmişdir.

***Fermentlərin aktivliyinin təyini.*** Ferment preparatlarının alınması üçün bakteriya ştamları uyğun substratlar olan mühitdə 30°C-də becərilmişdir. Tələb olunan müddətdən sonra hüceyrələr və kultura mayesi sentrifuqada 15 dəqiqə ərzində 10000 dövrə/dəqiqə sürətlə ayrılmışdır. Supernatant təmizlənməmiş ferment preparatı kimi istifadə edilmişdir.

Amilazanın təyini üçün Yamaguchi və b.-nın metodundan istifadə edilmişdir (Yamaguchi et al., 1969). Həll olan nişastanın 0,04 M fosfat buferində (pH 6,0) 2 ml 0,5%-li məhlulu 1 ml ferment preparatı ilə qarışdırılmışdır. 40°C-də müəyyən müddət inkubasiyadan sonra 0,2 ml qarışıq 5 ml 0,167 mM $I_2$-KI məhluluna əlavə edilmişdir. Optiki sıxlıq spektrofotometrdə 700 nm dalğa uzunluğunda ölçülmüşdür. 0,1 mq həll olan nişastanı 1 dəqiqə ərzində parçalamaq üçün tələb olunan aktivlik vahid kimi qəbul edilmişdir.

Lipazanın aktivliyi p-nitrofenol miristatdan (pNPM) substrat kimi istifadə etməklə təyin edilmişdir. Substratın 2-propanolda məhlulu son qatılq 1 mM olmaq şərti ilə reaksiya qarışığına əlavə edilmişdir. 10 dəqiqə ərzində 30°C-də inkubasiyadan sonra 0,2 ml ferment preparatı reaksiya qarışığına (pH 9,0) əlavə edilmiş, 60°C-də 20 dəqiqə saxlanılmış, daha sonra 2,0 ml $Na_2CO_3$ (0,25M) məhlulu ilə fermentin fəaliyyəti dayandırılmışdır. Spektrofotometrdə 410 nm dalğa uzunluğunda yaranmış p-nitrofenolun (pNP) miqdarı ölçülmüşdür. Bir dəqiqə ərzində 1 µmol pNP azad edən lipaza aktivliyi vahid kimi müəyyən edilmişdir.

Eksperimentlərdə reaksiya mühitinin pH və temperaturu məqsədə uyğun olaraq dəyişdirilmişdir.

***Fermentlərin xarakteristikası.*** Mühitin turşuluq göstəricisinin fermentlərin aktivliyinə təsiri 0,1 M natrium asetat (pH 5,0-5,5), 0,1 M natrium fosfat (pH 6,0-7,5) və 0,1 M Tris-HCl buferlərindən (pH 8,0-10,0) istifadə etməklə pH 4,5-10,0 arasında sınaqdan keçirilmişdir. Fermentlərin aktivliyi mühitdə natrium xloridin 0-20% qatılıqlarında öyrənilmişdir. Optimal temperaturun müəyyənləşdirilməsi 30-80°C-də yerinə yetirilmişdir. Fermentlərin termiki stabilliyinin yoxlanılması üçün ferment preparatı 40-80°C-də saxlanılmış, sonra aktivliyi qiymətləndirilmişdir. Bir saat ərzində fermentin aktivliyinin 100% saxlanıldığı temperatur müəyyənləşdirilmişdir. Digər amillərin təsiri də bu qayda ilə təyin edilmişdir.

Həlledicilərə davamlılığın təyini üçün sınaq şüşələrində 3,0 ml ferment preparatı və 1,0 ml üzvi həlledici qarışdırılmışdır. Qarışıq 30ºC-də 200 dövrə/dəqiqə sürətlə 24 saat ərzində yelləndiricidə silkələndirilmiş, sonra nümunələr həlledici fazadan ayrılmış və fermentin aktivliyi ölçülmüşdür. Həlledici əlavə edilməyən ferment preparatı kontrol kimi qəbul edilmişdir.

Bütün təcrübələr üç təkrarda aparılmış, kənaraçıxmalar 5,0%-dən çox olmamışdır.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

***Halofil bakteriyaların ayrılması və identifikasiyası.*** Duzlu gölməçə və şoran torpaq nümunələrindən 9 bakteriya ştamı ayrılmış və *St1-St9* kimi işarə edilmişdir. Standart metodlarla kulturaların morfoloji, fizioloji və biokimyəvi xarakteristikası təyin edilmişdir (Cədvəl 1). Nəticələr, *St9* istisna olmaqla, digər bakteriyaların Qrama görə mənfi, *St9* bakteriya ştamının isə Qram müsbət olduğunu göstərmişdir. Diffuziyaedici piqmentlər sintez edilməmişdir, yalnız *St9* endospor əmələ gətirmişdir. *St3* ştamının koloniyasının rəngi qırmızımtıl narıncı, digərləri isə ağ və sarı rəng arası müxtəlif çalarlarda rənglənmişdir. Duza davamlılığa görə orta dərəcədə halofil və halotolerantdırlar. Geniş intervalda pH-a davamlı olsalar da neytrofildirlər. MR-VP testləri mənfidir.

Cədvəl 2-də fenol qırmızısı əlavə edilmiş mühitdə şəkərlərin fermentasiya reaksiyalarının nəticələri və antibiotiklərə rezistenlik indeksinin göstəriciləri təqdim edilmişdir. Beləliklə, cədvəllərdə təqdim edilmiş göstəricilərə əsasən *St1, St2, St5, St6, St7, St8 Halomonas* cinsinin, *St3* və *St4 Halococcus* cinsinin, *St9* isə *Bacillus cereus* növünün ştammları kimi identifikasiya edilə bilər.

***Lipaza və amilaza sintez edən bakteriyaların skrininqi.*** Apardığımız tədqiqatın əsas məqsədinə uyğun olaraq, halofil mikroorqanizmlərdən davamlı fermentlərin alınması üçün onlar uyğun mühitlərdə yetişdirilmişdir. Alınmış nəticələr ayrılmış mikroorqanizm kulturalarının müəyyən dərəcədə hər iki fermenti sintez etdiyini göstərmişdir. Ayrılmış halofil bakteriya ştamlarında lipaza fermentinin aktivliyinin təyini 9 bakteriya ştamının əksəriyyətinin müsbət reaksiya verdiyini göstərmiş, amilaza isə 3 bakteriya ştamında aşkar edilmişdir. Fermentativ aktivlik indeksinin təyininin nəticələrinə əsasən (təmiz sahənin diametrinin koloniyanın diametrinə nisbəti) maksimum miqdarda lipaza (*St 6, Halomonas sp.*) və maksimum miqdarda amilaza (*St. 9, Bacillus cereus*) sintez edən bakteriya ştamları sonrakı tədqiqatların obyekti kimi seçilmişdir.

***B. cereus ştamının böyüməsinə və amilaza sintezinə NaCl-un qatılığının təsiri.*** Bu ştam NaCl əlavə edilməmiş mühitdə 5 günlük inkubasiyadan sonra da inkişaf etməmişdir. Sürətli böyümə mühitə 5,0, 10,0 və ya 15,0% NaCl əlavə edildikdən sonra alınmışdır. Bu zaman maksimum biokütlə 2-4 gün arasında toplanmışdır. Mühitə 20% NaCl əlavə edildikdə isə lag faza 3 günə kimi uzanmışdır. Tərkibində 1, 2 və ya 3 M qlükoza olan duzsuz mühitdə böyümə qeydə alınmamışdır. Beləliklə, *B. cereus* orta dərəcəli halofildir.

Tədqiq edilən bakteriya ştamı mühitə nişasta əlavə edilmədikdə, NaCl qatılığından asılı olmayaraq çox zəif amilaza aktivliyi göstərmişdir. Amilaza sintezi mühitə həll edilə bilən nişasta əlavə etdikdə yüksəlmişdir. Onun sintezi hətta 1,0% nişasta olan mühitə 0,5% qlükoza əlavə etdikdə də xeyli azalmışdır. Nəzərə çarpacaq miqdarda amilaza 5,0 və 10,0% NaCl əlavə edilmiş mühitlərdə iki günlük becərilmədən sonra alınmışdır (Şəkil 1). 4 günlük inkubasiyadan sonra 15,0% NaCl olan mühitdə amilazanın sintezi orta dərəcədə olmuşdur. 20,0% NaCl-la 5 günlük inkubasiyadan sonra bakteriyanın böyüməsi orta dərəcədə olmuş, ancaq çox az miqdarda amilaza sintez edilmişdir. Qeyd etmək lazımdır ki, bakteriya hüceyrələrindən alınan homogenatın amilaza aktivliyi ümumi amilaza aktivliyinin yalnız 0–0,5%-nə bərabər olmuşdur və bu tədqiq edilən bakteriya ştamının sintez etdiyi amilazanın hüceyrəxarici olduğunu göstərir.

***NaCl duzunun, temperaturun və pH-ın amilazanın aktivliyinə təsiri.*** 10,0% NaCl əlavə edilmiş mühitdə 2 gün böyümüş *Bacillus cereus St9* kulturasının supernatantının amilaza fəaliyyəti NaCl-un iki qatılığında (0,5% və 10,0%), müxtəlif temperatur və pH–da yoxlanılmışdır (Cədvəl 3).

30°C-də amilazanın aktivliyi hər iki qatılıqda – yüksək və aşağı qatılıqda demək olar ki, eyni olmuşdur. Əksinə, 40°C və daha yuxarı temperaturda pH-ın 5,0-8,0 arası göstəricilərində bu fermentin aktivliyi duzun qatılığından asılı olmuşdur. pH-ın 4,0; 9,0 və 10,0 göstəricilərində isə amilaza fermentinin aktivliyi çox aşağıdır. Ümumiyyətlə, 60°C-də aktivlik çox aşağı və 70°C-də cüzi olmuşdur. Maksimum amilaza aktivliyi qeydə alınan variantlarda (pH 6, 40°C; pH 7, 50°C və pH 8, 50°C) fermentin aktivliyi və NaCl-un qatılığı arasında asılılıq daha ətraflı öyrənilmişdir (Şəkil 2). Alınmış göstəricilərə görə amilazanın maksimal fəaliyyəti üçün pH 6,0 və 40°C-də 0,5–1,5%, pH 7 və 50°C-də 1,5–2,5%, pH 8,0 və 50°C-də 1,0–3,0% NaCl tələb olunur. Lakin hər üç şəraitdə amilaza daha yüksək duz qatılıqları ilə ingibirə edilmişdir.

Alınmış nəticələr amilazanın duza tələbinin temperatur və pH-dan asılı olduğunu göstərir

***Halomonas St.6 ştamının böyüməsinə və lipaza sintezinə NaCl-un qatılığının təsiri.*** Lipaza produsenti kimi secilmiş bakteriya ştamı *Halomonas St6* 1,0-20% qatılıqda NaCl olan mühitdə yaxşı böyüyür. Bu bakteriya, duzsuz mühitdə də çoxalma qabiliyyətini saxlayır. Onun optimal böyüməsi üçün mühitin pH-ı 8,0, becərilmə temperaturu 28-37°C və NaCl-un qatılığı 10,0% olmalıdır. Optimal şəraitdə böyümə zamanı lag fazanın müddəti 2 saatdır. Stasionar fazaya isə kultura 32 saatdan sonra daxil olur. Lipaza sintezi yalnız 6 saatdan sonra – eksponensial fazanın əvvəlindən sonra qeydə alınmış və 40 saatdan sonra - stasionar fazanın ortalarında maksimal göstəriciyə qalxmışdır (Şəkil 3).

Bakteriya hüceyrələrinin lipaza aktivliyi qeydə alınan hüceyrəxarici aktivlikdən 7-8 dəfə az olmuşdur.

**Cədvəl 1.** Ayrılmış halofil bakteriyaların morfoloji, fizioloji və biokimyəvi xarakteristikası

| Testlər | Bakteriya ştamları | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | St 1 | St 2 | St 3 | St 4 | St 5 | St 6 | St 7 | St 8 | St 9 |
| | **Morfoloji xarakteristikası** | | | | | | | | |
| Koloniya- forma, rəng | dairəvi, ağ | dairəvi, krem | dairəvi, qırmızı | dairəvi, qırmızı | dairəvi, ağ | dairəvi, ağ | dairəvi, sarı | dairəvi, ağ | dairəvi, krem |
| Qrama görə | - | - | - | - | - | - | - | - | + |
| Hüceyrə ölçüsü, dm,və ya eni-uzu, µm | 0,6-0,7 1,6-1,8 | 0,7-0,8 1,8-1,9 | 0,8-1,5 | 0,8-1,5 | 0,6-0,8 1,7-1,8 | 0,7-0,8 1,8-1,9 | 0,6-0,8 1,6-1,8 | 0,6-0,8 1,6-1,9 | 0,8-2,5 |
| Hüceyrələrin birləş-si | Tək | Tək | Cüt | Tetrada | Tək | Tək | Tək | Tək | Tək |
| Endospor | - | - | - | - | - | - | - | - | - |
| Hərəkətlilik | + | + | + | + | + | + | + | + | + |
| | **Fizioloji xarakteristikası** | | | | | | | | |
| pH həddi | 5-10 | 5-10 | 5 | 10 | 5-10 | 5-10 | 5-10 | 5-10 | 4,5-9 |
| Optimal pH | 7 | 7 | 7 | 7 | 7 | 7 | 7 | 7 | 7 |
| Temperatur həddi, °C | 18-45 | 18-45 | 18-45 | | 18-45 | 18-45 | 18-45 | 18-45 | 18-45 |
| Optimal temperatur,°C | 28 | 28 | 30-37 | 30-35 | 28 | 28 | 28 | 28 | 28 |
| NaCl-a davamlılıq, % | 5-20 | 5-20 | 5-30 | 5-30 | 5-20 | 5-20 | 5-20 | 5-20 | 0-15 |
| Optimal NaCl, % | 5 | 5 | 10 | 8 | 5 | 5 | 5 | 5 | 5 |
| | **Biokimyəvi xarakteristikası** | | | | | | | | |
| VP testi | - | - | - | - | - | - | - | - | - |
| MR testi | - | - | - | - | - | - | - | - | - |
| Sitrat sərfi | - | - | - | - | - | - | - | - | + |
| İndol alınması | - | - | - | - | - | - | - | - | - |
| $H_2S$ | - | - | - | - | - | - | - | - | - |
| Katalaza | + | + | + | + | + | + | + | + | + |
| Lizindekarboksilaza | - | - | - | - | - | - | - | - | - |
| Omitindekarboksilaza | - | - | - | - | - | - | - | - | - |
| Arginindekarboksilaza | - | - | - | - | - | - | - | - | - |
| Fenilalanindeaminaza | - | - | - | - | - | - | - | - | - |
| Triptofandeaminaza | - | - | - | - | - | - | - | - | - |
| Nitratreduktaza | + | + | + | + | + | + | + | + | + |
| G+C Mol % | 60,5+0, | 60,5+0,5 | 61-66 | 61-66 | 60,5+0,5 | 60,5+0,5 | 60,5+0,5 | 60,5+0,5 | 35 |




**Şəkil 1**. Mühitdə olan NaCl duzunun qatılığının *Bacillus cereus St9*–un amilaza sintezinə təsiri




**Şəkil 2.** NaCl duzunun qatılığının *Bacillus cereus St9*–dan alınmış təmizlənməmiş ferment preparatının amilaza aktivliyinə təsiri.

**Cədvəl 2.** Şəkərlərin fermentasiya reaksiyalarının nəticələri və antibiotiklərə rezistenlik indeksinin göstəriciləri

| Şəkərlər, antibiotikə davamlılıq indeksi | Bakteriya ştamları | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | St 1 | St 2 | St 3 | St 4 | St 5 | St 6 | St 7 | St 8 | St 9 |
| Arabinoza | + | + | - | - | + | + | + | + | - |
| Qlükoza | + | + | - | + | + | + | + | + | + |
| Frukroza | + | + | - | - | + | + | + | + | + |
| Qliserin | - | - | - | - | - | - | - | - | + |
| Qlisin | + | + | + | + | + | + | + | + | + |
| Qalaktoza | + | + | + | + | + | + | + | + | + |
| m-inozitol | + | + | - | - | + | - | + | - | - |
| Maltoza | + | + | - | - | + | + | + | + | + |
| Mannoza | + | + | + | + | + | + | + | + | + |
| Mannitol | + | + | - | - | + | + | + | + | + |
| maltotrioza | + | + | - | - | + | + | + | + | + |
| Na-asetat | + | + | - | - | + | + | + | + | + |
| Na-benzoat | - | - | - | - | - | - | - | - | - |
| Na-fumarat | + | - | - | - | + | - | - | - | + |
| Na-suksinat | + | - | - | - | + | - | + | - | + |
| Laktoza | + | + | - | - | + | + | + | + | - |
| Ramnoza | + | + | + | + | + | + | + | + | + |
| Saxaroza | + | + | + | + | + | - | - | - | + |
| Salisin | + | + | + | + | + | - | - | - | + |
| Ksiloza | + | + | + | + | + | + | + | + | - |
| Antibiotikə davamlılıq indeksi | 0,42 | 0,41 | 0,92 | 0,93 | 0,40 | 0,40 | 0,42 | 0,40 | 0,85 |

**Cədvəl 3.** *Bacillus cereus St9*-dan alınmış təmizlənməmiş ferment preparatının amilaza aktivliyinə temperatur və pH-ın təsiri

| pH və NaCl | Temperatur | | | | |
|---|---|---|---|---|---|
| | 30°C | 40°C | 50°C | 60°C | 70°C |
| pH 4 | | | | | |
| 0,5% | 0 | 0 | 0 | 8 | 1 |
| 10% | 0 | 0 | 10 | 1 | 0 |
| pH 5 | | | | | |
| 0,5% | 20 | 28 | 30 | 10 | 3 |
| 10% | 22 | 15 | 7 | 2 | 0 |
| pH 6 | | | | | |
| 0,5% | 28 | 50 | 40 | 20 | 10 |
| 10% | 30 | 27 | 15 | 5 | 0 |
| pH 7 | | | | | |
| 0,5% | 10 | 40 | 50 | 20 | 10 |
| 10% | 19 | 20 | 7 | 3 | 0 |
| pH 8 | | | | | |
| 0,5% | 5 | 31 | 50 | 18 | 9 |
| 10% | 4 | 15 | 2 | 1 | 0 |
| pH 9 | | | | | |
| 0,5% | 0 | 18 | 5 | 0 | 0 |
| 10% | 0 | 3 | 0 | 0 | 0 |
| pH10 | | | | | |
| 0,5% | 0 | 0 | 0 | 0 | 0 |
| 10% | 0 | 0 | 0 | 0 | 0 |




**Şəkil 3.** Müxtlif qatılıqda NaCl əlavə edilmiş mühitdə böyümüş *Halomonas St6* kulturasının hüceyrəxarici lipaza aktivliyi

***NaCl duzunun, temperaturun və pH-ın lipazanın aktivliyinə təsiri.*** Duzun qatılığının, temperaturun, pH-ın lipaza fəaliyyətinə təsiri 10% NaCl əlavə edilmiş mühitdə 40 saatlıq inkubasiyadan sonra alınmış kultura mayesində yoxlanılmışdır. Təmizlənməmiş hüceyrəxarici lipaza fermenti preparatı kimi qəbul edilən kultura mayesi geniş temperatur intervalında lipaza fəallığı göstərmiş, 60°C-də optimal aktivlik qeydə alınmışdır (göstəricilər təqdim edilmir). Hətta 90°Cdə ferment fəaliyyətini saxlamış və onun göstəricisi optimaldan 50,0% aşağı olmuşdur.

Lipaza preparatının aktivliyi mühitin turşluluq göstəricisinin geniş diapazonunda (6,0-12,0) qeydə alınmışdır. Optimal pH-ın 9,0 olduğu aşkar edilmişdir. pH-ın 12 göstəricisində bu fermentin aktivliyinin 30 faizi saxlanılmışdır.

NaCl duzunun qatılığının lipazanın aktivliyinə təsirinin öyrənilməsi üçün reaksiya mühitinə 0; 1,0; 5,0; 10,0 və 15,0% NaCl əlavə edilmişdir. İnkubasiya temperaturu 60°C, mühitin pH göstəricisi isə 9,0 olmuşdur. Ən yüksək aktivlik 10,0% NaCl variantında alınmışdır. Duzluluq 15,0% olduqda lipazanın funksiyası təxminən 50,0%, duzsuz mühitdə isə >60,0% saxlanılmışdır.

Bu iş Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı fondunun maliyyə yardımı ilə yerinə yetirilmişdir **– Qrant № EİF-2011-1(3)-82/53/3.**

## ƏDƏBİYYAT

**Bowers K., Mesbah N., Wiegel J.** (2008) *Natranaerobius 'grantii' and Natranaerobius 'jonesii'*, spp. nov., two anaerobic halophilic alkaliphiles isolated from the Kenyan-Tanzanian Rift [abstract]. Abst. Gen. Meet. Am. Soc. Microbiol. Boston, **I-007**.

**Cayol J., Ollivier B., Patel B., Ageron E., Grimont P., Prensier G., Garcia J.** (1995) Halanaerobium lacusroseus sp. nov., an extremely halophilic fermentative bacterium from the sediments of a hypersaline lake. Int. J. Syst. Evol. Microbiol., **45**:790-797.

**Imhoff J., Trüper H.** (1977) *Ectothiorhodospira halochloris* sp. nov., a new extremely halophilic phototrophic bacterium containing bacteriochlorophyll. Arch. Microbiol., **114**:116-121.

**Mathabatha E.S.** (2010) Diversity and industrial potential of hydrolase producing halophilic/ halotolerant eubacteria. African Journal of Biotechnology, **9 (11)**:1555-1560.

**Moreno M.L., Dolerez P., Garcia M.T., Mellado E.** (2013) Halophilic Bacteria as a Source of Novel Hydrolytic Enzymes. Life. **3**: 38-51.

**Rohban R., Amoozegar M.A., Ventosa A.** (2009) Screening and isolation of halophilic bacteria producing extracellular hydrolyses from Howz Soltan Lake, Iran. J. Ind. Microbiol. Biotechnol., **36**:333-340.

**Sanchez-Porro C., Martin S., Mellado E., Ventosa A.** (2003) Diversity of moderately halophilic bacteria producing extracellular hydrolytic enzymes. J. Appl. Microbiol.Ş **94**:295-300.

**Smibert R., Krieg N.** (1994) Phenotypic characterization. *In: Gerhardt P. (ed)* Methods for general and molecular bacteriology. American Society for Microbiology Washington, DC, 607-654.

**Ventosa A., Garcia M.T., Kamekura M., Onishi H., Ruiz-Berraquero F.** (1989) *Bacillus halophilus* sp. nov., a moderately halophilic *Bacillus* species. Syst. Appl. Microbiol., **12**:162-166.

**Yamaguchi K., Matsuzaki H., Maruo B.** (1969) Participation of a regulator gene in the a-amylase production of *Bacillus* subtilis. J. Gen. Appl. Microbiol., **15**:97-10.

## Продукция Внеклеточной Липазы и Амилазы Галофильными Бактериями

**Я.Ю. Атакишиева, К.Х. Исаева, И.М. Иманова, Ш.А. Фейзуллаева**

*Институт микробиологии НАНА*

Из образцов, взятых из соленых водоемов и почв полуострова Абшерон в Азербайджане, изолированы 9 бактериальных штаммов. На основе морфологических, физиологических и биохимических особенностей, шесть штаммов были идентифицированы как представители рода *Halomonas*, два – как представители рода *Halococcus*, один штамм был идентифицирован как представитель *Bacillus cereus*. Бактериальные штаммы были проверены на продукцию внеклеточной липазы и амилазы. *Bacillus cereus St9* показал сравнительно высокую активность амилазы, а *Halomonas St3* – активность липазы. Активность липазы культуральной жидкости *Halomonas St3* была оптимальна при 60°C, pH 9,0 и 10% NaCl в реакционной смеси. Подходящая концентрация соли, температура и pH для максимальной активности амилазы культуральной жидкости *Bacillus cereus St9* были 0,5 – 3,0% NaCl, 50°C, pH 7,0-8,0.

***Ключевые слова:*** *галофильные бактерии, внеклеточная активность, липаза, амилаза*

**Activity of Extracellular Lipase and Amylase by Halophilic Bacteria**

**Y.Y. Atakishiyeva, K.Ch. Isayeva, I.M. Imanova, Sh.A. Feyzullayeva**

*Institute of Microbiology, ANAS*

Nine halophilic amd halotolerant bacterial strains were isolated from samples obtained in saline ponds and soils of Absheron peninsula in Azerbaijan. Based on morphological, physiological and biochemical features, six strains were identified tentatively as members of the genus *Halomonas*, two isolates as *Halococcus sp.*, while one was identified as *Bacillus cereus*. Bacterial strains were screened for production of extracellular lipase and amylase. *Bacillus cereus St9* exhibited the highest amylase activity and *Halomonas St3* produced the largest amount of the lipolytic enzyme. The optimal combination of salt concentration, temperature and pH for maximum amylase activity of cultural broth from *Bacillus cereus St9* was 0.5 – 1.5% NaCl, 50°C, pH 7. The lipase activity of cultural broth of *Halomonas St3* was optimal at 60°C, pH 9.0 and 10% NaCl.

***Key words:*** *halophilic bacteria, extracellular activity, lipase, amilase*

AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 60-65 (2014)

# Влияние Экспериментального Нефтяного Загрязнения на Кровь Сазана

**Х.М. Сафиханова*, Р.Ю. Касимов, Э.К. Рустамов**

*Институт физиологии им. А.И. Караева НАНА, ул. Шариф-заде, 2, Баку AZ1100, Азербайджан;*
**E-mail: namik.s@mail.ru*

**В работе на примере куринского сазана показано, что в результате воздействия сырой нефти концентрацией 100мг/л в мазках крови увеличивается процентное соотношение незрелых эритроцитов. Обнаружено возрастание числа анизацитозных и пойкилоцитозных клеток, эритроцитов с патологическими изменениями морфологической организации. В данном исследовании также установлено процентное отношение различных лейкоцитов, которое показало лимфоцитарный характер крови этих рыб.**

***Ключевые слова:*** *нефтяное загрязнение, сазан, кровь, эритроциты, лейкоциты*

## ВВЕДЕНИЕ

Известно, что неблагополучное состояние водной среды, в том числе и загрязнение нефтью, вызывает различные нарушения морфологической организации клеток крови рыб (Кузина, 2010; Кузина, 2011; Alkindi et al., 2005; Cavas et al., 2003). В работах, посвящённых воздействию нефти, а также её производных показаны значительные патологические изменения строения эритроцитов у различных видов рыб (Аленичев, 2002; Кармазин, 2010; Al-Ayed, 2001; Vanzella, 2007). Нарушения морфологической организации эритроцитов ведёт к угнетению, а в некоторых случаях и к невозможности их функционирования, и прежде всего, газообмена в этих клетках (Бугаев и др., 2007). Следует отметить, что концентрация сырой нефти и время её воздействия, существенно влияют на степень, вызываемых ею патологических изменений в морфологии этих клеток. Так опыты, проведённые на карпах (*Cyprinus carpio* L.) в экспозициях с сырой нефтью демонстрируют эту зависимость в динамике появления различных патологий – базофилия цитоплазмы, пикноз ядер и агглютинация эритроцитов (Каниева, 2002).

Исследование воздействия сырой нефти было изучено и на примере пресноводной рыбы – ореохромиса (*Oreochromis niloticus*), которое также выявило дозозависимое действие этого вещества (Al-Ayed, 2001).

Воздействие различных нефтепродуктов на рыб также вызывает нарушения морфологической организации эритроцитов. Так, на примере прохилода (*Prochilodus lineatus*) показано, что водорастворимая фракция дизельного топлива является причиной увеличения числа эритроцитов периферической крови рыб, имеющих патологические отклонения строения их ядер (Vanzella, 2007).

Целью нашего исследования было изучение влияния сырой нефти концентрацией 100 мг/л на строение форменных элементов крови куринского сазана (*Cyprinus carpio*) .

## МАТЕРИАЛЫ И МЕТОДЫ

В эксперименте использовалась 6-месячная молодь сазана (*Cyprinus carpio*) весом 35,1-44,6 г, длиной 21,6-27,1 см. Рыбы были взяты с Хыллинского рыбоводного завода, расположенного в Нефтчалинском районе (Азербайджан). Экспериментальная часть работы проводилась в условиях Института физиологии. Среднесуточная температура воды в ваннах, где содержались подопытные рыбы, составляла 22-24ºС. Концентрация сырой нефти (месторождение «Нефтяные Камни») была 100 мг/л. Взятие материала проводилось на 5, 10 и 15 сутки.

В каждый из вышеуказанных дней у исследуемых рыб бралась кровь методом отсечения хвостового плавника и на предметных стёклах готовились мазки. После их просушивания проводилась фиксация этиловым спиртом в течение 5 мин. Просушенные фиксированные мазки окрашивались азур-эозиновым краси-телем, используя общепринятый метод Романовского. Окрашенные мазки крови промывались дистиллированной водой. Изучение мазков крови проводилось под световым микроскопом NU2 (Carl Zeiss, Jena). Процентное соотношение патологических эритроцитов вычислялось из расчёта на 1000 эритроцитов. В работе также представлено процентное соотношение различных типов лейкоцитов (процентное соотношение их зрелых и незрелых форм, а также гранулоцитов и агранулоцитов), которое определялось путём их подсчёта исходя из 200 клеток. Фотографирование производилось при помощи цифровой камеры Canon G-9.

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 92-96 (2014)*

# Azərbaycan Mənşəli Yumşaq Buğda *(Triticum Aestivum* L.*)* Genotiplərinin Terminal İstiliyə Davamlılığının Çoxölçülü Statistik Analiz Üsulu İlə Qiymətləndirilməsi

**E.S. Hacıyev*, R.T.Əliyev**

*AMEA Genetik Ehtiyatlar İnstitutu, Azadlıq 155,Bakı AZ 1106, Azərbaycan;*
**E-mail:elchinhajiyev85@gmail.com*

**Milli Genbankda saxlanılan yumşaq buğdanın 10 sortunun və müxtəlif növmüxtəlifliklərinə aid 100 genotipinin 11 əlamət üzrə müqayisəli qiymətləndirilməsinin nəticələri verilmişdir. Çoxölçülü statistik analiz üsulu ilə müəyyən edilmişdir ki, genbank nümunələri rayonlaşmış və perspektiv sortlara nisbətən daha geniş genetik variasiyaya malikdir. Tədqiq edilən əlamətlər əsasında aparılan statistik analiz nəticəsində ən yüksək göstəriciyə malik və terminal istiliyə yüksək davamlı 20 genotip seçilmişdir. Nəticələrin təhlili göstərmişdir ki, 30 sünbüldə olan dənlərin sayı, 1000 dənin kütləsi və xlorofilin miqdarı əlamətlərinə görə genotiplər bir-birindən daha çox fərqlənir. Kompleks göstəricilərə malik 20 nümunə içərisində genbank nümunələri ilə yanaşı, Günəşli, Qırmızı buğda, Şəki 1, Pərzivan 2 sortlarına da rast gəlinmişdir. Seçilmiş genotiplərdən terminal istiliyə davamlı sortların yaradılmasında başlanğıc material kimi istifadə olunması tövsiyə olunur.**

***Açar sözlər:*** *Triticim aestivum* L.*, növmüxtəliflik, çoxölçülü statistik analiz, terminal istilik*

## GİRİŞ

Buğda ən qədim mədəniləşdirilən bitkilərdən biri olmaqla, 8 min ildən çoxdur ki, insanların qidasının əsasını təşkil edir. Buğdanın məhsuldarlığının artırılması, abiotik və biotik stres amillərə davamlılığının tədqiqi olduqca vacibdir (Hajiyev et al., 2013). Buğda bitkisinin məhsuldarlığına ən çox təsir edən amillərdən biri istilik stresi hesab olunur. Buğdanın dünya üzrə əkin sahəsinin 40%-dən çox hissəsində (65-70 milyon hektar) istilik stresi buğdanın müxtəlif inkişaf mərhələlərinə mənfi təsir göstərir (Seçkin, 2011). Buğda becərilən 7 milyon hektar ərazi isə daimi istilik stresinin təsiri altındadır. Yüksək temperatur ($35^0$C) və bununla bağlı istilik stresi çox zaman buğdanın dən dolma mərhələsinə mənfi təsir göstərir, nəticədə dən normal dolmur, dənin ölçüsü, sayı və kütləsi azalır ki, bu da məhsuldarlığın əhəmiyyətli dərəcədə azalmasına gətirib çıxarır (Reynolds, 1998; Stone, 1995). İstilik stresi, həmçinin, fotosintez prosesinin normal gedişinə mənfi təsir göstərir (Stone and Nicolas, 1995; Crafts, 2000). Bitkilərin terminal istilik stresinə cavab reaksiyası müxtəlifdir. Eyni cinsə daxil olan müxtəlif növlərin, həmçinin eyni növə daxil olan növmüxtəlifliklərinin, nümunələrin, sortların da istilik stresinə cavab reaksiyası fərqlidir. Bu amil əsas götürülərək müxtəlif parametrlər əsasında terminal istiliyə davamlı nümunələr seçilir və onlardan seleksiya proqramlarında istifadə olunur.

Yüksək temperatur nəticəsində yaranan və payızlıq buğdanın dəndolma mərhələsinə təsadüf edən terminal istilik stresi, Azərbaycanda da əhəmiyyətli məhsul itkisinə səbəb olur. Baş verən qlobal iqlim dəyişkənliyi nəticəsində istilik stresinin daha da kəskinləşməsi gözlənilir. Odur ki, istiliyə davamlı payızlıq buğda sortlarının yaradılması Azərbaycan üçün çox vacibdir. Bu prosesin effektivliyini yüksəltmək üçün, buğda genetik ehtiyatlarının terminal istiliyə davamlılıqla əlaqəli olan əlamətlərə görə geniş genetik variasiyasının mövcudluğu tələb olunur.

Tədqiqat işində əsas məqsəd yumşaq buğdanın Milli genbankda saxlanılan və müxtəlif növmüxtəlifliklərinə aid nümunələrinin, eləcə də rayonlaşmış və perspektiv 10 sortunun müqayisəli qiymətləndirilməsi və terminal istilik stresinə davamlılıq da daxil olmaqla, təsərrüfat göstəricilərinə görə fərqlənən formalarının seçilməsidir.

## MATERİAL VƏ METODLAR

Tədqiqat işi AMEA Genetik Ehtiyatlar İnstitutunun təcrübə sahəsində yumşaq buğdanın 10 rayonlaşmış və perspektiv sortu (Ruzi-84, Mirbəşir-128, Əkinçi-84, Qobustan, Şəki-1, Qırmızı buğda, Günəşli, Şəfəq, Əzəmətli-95 və Pərzivan-2) və 100 genbank nümunəsi üzərində aparılmışdır. Genbank nümunələrinə əvvəlki illərdə Azərbaycanın müxtəlif bölgələrindən toplanılmış və 3 il ərzində GEİ-nin təcrübə sahəsində öyrənilmiş sabit formalar daxildir.

Cədvəl 1-dən göründüyü kimi, tədqiqat materialı Alpha Latic dizayn üsulu ilə hər nümunədən 60 dən, toxumarası məsafə 4 sm, cərgəarası məsafə isə 20 sm olmaqla səpilmişdir.

**Cədvəl 1.** Alpha Latic dizaynının sxemi

| | | | | | | | | | | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| **Plot №** | **1** | **2** | **3** | **4** | **5** | **6** | **7** | **8** | **9** | **10** | **11** | **12** | **13** | **14** | **15** | **16** | **17** | **18** | **19** | **20** |
| **Müxtəliflik** | *A1* | *V6* | *V8* | *A2* | *A3* | *A4* | *A5* | *V7* | *V1* | *V9* | *A6* | *A7* | *A8* | *A9* | *A10* | *A11* | *A12* | *A13* | *V10* | *V5* |
| **Plot №** | **21** | **22** | **23** | **24** | **25** | **26** | **27** | **28** | **29** | **30** | **31** | **32** | **33** | **34** | **35** | **36** | **37** | **38** | **39** | **40** |
| **Müxtəliflik** | *A14* | *V3* | *A15* | *A16* | *A17* | *A18* | *V2* | *A19* | *A20* | *A21* | *V4* | *A22* | *A23* | *A24* | *A25* | *A26* | *A27* | *V1* | *A28* | *A29* |
| **Plot №** | **41** | **42** | **43** | **44** | **45** | **46** | **47** | **48** | **49** | **50** | **51** | **52** | **53** | **54** | **55** | **56** | **57** | **58** | **59** | **60** |
| **Müxtəliflik** | *A30* | *A31* | *A32* | *V7* | *V6* | *A33* | *V4* | *A34* | *V10* | *V9* | *A35* | *A36* | *A37* | *V8* | *V3* | *A38* | *A39* | *V5* | *A40* | *A41* |
| **Plot №** | **61** | **62** | **63** | **64** | **65** | **66** | **67** | **68** | **69** | **70** | **71** | **72** | **73** | **74** | **75** | **76** | **77** | **78** | **79** | **80** |
| **Müxtəliflik** | *A42* | *A43* | *V2* | *A44* | *A45* | *A46* | *A47* | *A48* | *A49* | *A50* | *V7* | *V2* | *A51* | *A52* | *A53* | *V1* | *A54* | *A55* | *A56* | *A57* |
| **Plot №** | **81** | **82** | **83** | **84** | **85** | **86** | **87** | **88** | **89** | **90** | **91** | **92** | **93** | **94** | **95** | **96** | **97** | **98** | **99** | **100** |
| **Müxtəliflik** | *A58* | *A59* | *A60* | *A61* | *V5* | *A62* | *A63* | *V9* | *A64* | *A65* | *A66* | *V4* | *A67* | *V10* | *V6* | *V8* | *A68* | *V3* | *A69* | *A70* |
| **Plot №** | **101** | **102** | **103** | **104** | **105** | **106** | **107** | **108** | **109** | **110** | **111** | **112** | **113** | **114** | **115** | **116** | **117** | **118** | **119** | **120** |
| **Müxtəliflik** | *A71* | *A72* | *A73* | *A74* | *A75* | *A76* | *V2* | *V8* | *A77* | *V7* | *V5* | *V3* | *V4* | *A78* | *A79* | *A80* | *A81* | *A82* | *A83* | *A84* |
| **Plot №** | **121** | **122** | **123** | **124** | **125** | **126** | **127** | **128** | **129** | **130** | **131** | **132** | **133** | **134** | **135** | **136** | **137** | **138** | **139** | **140** |
| **Müxtəliflik** | *A85* | *A86* | *A87* | *V10* | *A88* | *A89* | *A90* | *A91* | *A92* | *A93* | *A94* | *A95* | *V6* | *V9* | *A96* | *A97* | *A98* | *V1* | *A99* | *A100* |

**A1.......A100 =genbank nümunələri**
**V1.......V10 = sortlar**

Vegetasiya müddətində təcrübə sahəsi 3 dəfə suvarılmış, iki dəfə hər kvadrat metrə 13 q olmaqla amonium nitrat verilmişdir. Bəzi morfoloji əlamətlər üzrə (sünbülləməyə qədər olan günlərin sayı, fizioloji yetişkənliyə qədər olan günlərin sayı, dən dolma mərhələsinin davametmə müddəti, bir nümunədə olan bitkilərin sayı, təsadüfi seçilmiş 30 sünbüldə dənlərin orta sayı, bir bitkinin biokütləsi, 1000 dənin kütləsi) məlumatlar toplanılmış və qeyd edilmişdir.

Tədqiqatda yarpaqda xlorofilin miqdarı SPAD 502 cihazının köməyi ilə ölçülmüşdür. Hər bir nümunədə 30 bitkinin sonuncu yelkən yarpağının orta hissəsində ölçmə aparılmışdır. Ölçmələr sünbülləmə fazasından başlayaraq, 10 gündən bir, iki dəfə aparılmışdır. SPAD metr İnadanın metodu əsasında dizayn edilmiş və istehsal olunmuşdur (Camejo, 2005). SPAD – 502 yarpaq toxumasındakı işığın qırmızı və infraqırmızı zonalarını (659 nm – 940 nm dalğa uzunluğunda) ölçərək, nisbi xlorofil sıxlığını müəyyən edir (Inada, 1965; Minolta, 1989). Göstərilən məlumatlar çoxölçülu statistik analiz üsulu ilə tədqiq edilmişdir. Tədqiq edilən genotiplərdə xlorofilin miqdarı 11 və 21 May 2012-ci il tarixlərində ölçülmüşdür.

## NƏTICƏLƏR VƏ ONLARIN MÜZAKIRƏSI

Tədqiqat işində genotiplərin qiymətləndirilməsi 11 əlamətə görə aparılmış, alınmış nəticələr “GGE biplot” statistik paket proqramında analiz edilərək, şəkil 1-də təqdim olunmuşdur. Şəkil 1-dən göründüyü kimi, öyrənilən genbank nümunələri ilə rayonlaşmış və perspektiv sorlar bir-birindən tamamilə ayrılmış və tam fərqli qruplarda birləşmişdir. Şəkil 1-dən, həmçinin, genbank nümunələrinin geniş, sortların isə bir qədər məhdud variasiyaya malik olduğu da aydın görünür. Bu nəticələrə əsasən demək olar ki, genbank nümunələrinin öz aralarında və ya tədqiq olunan sortlarla çarpazlaşdırılması sortarası hibridləşmə ilə müqayisədə daha effektli olub, yeni perspektiv sortların yaradılmasında uğurla tətbiq oluna bilər. Aparılmış çoxölçülü statistik analiz üsulu ilə genotiplərin 11 əlamət əsasında seçimi də həyata keçirilmiş və tədqiq edilən 110 genotip içərisindən ən yüksək göstəricilərə malik 20 genotip seçilmişdir və bəzi biomorfoloji göstəricilər cədvəl 2-də verilmişdir. Çoxölçülü analiz üsulu ilə seçilmiş ən yaxşı genotip Naxçıvan MR-dan toplanılmış və yumşaq buğdanın *var. meridionale* növmüxtəlifliyinə aid 7319 nömrəli genbank nümunəsidir. Bu nümunənin 30 sünbülündə olan dənlərinin sayı 1054 ədəd, min dənin kütləsi isə 28 q olmuşdur. SPAD metr vasitəsilə əldə edilən nəticələr 11 may tarixində 46.8, 21 may tarixində isə 45 olmuş, 10 gün ərzində xlorofilin miqdarında cəmi 3.8% azalma baş vermişdir. Seçilmiş nümunələrdən ikincisi Qobustandan toplanılmış, *var.lutescens* növmüxtəlifliyinə aid nümunədir. Bu nümunədə 30 sünbüldə olan dənlərin sayı bir qədər aşağı – 754 ədəd, lakin 1000 dənin kütləsi 34 q olmuşdur. Xlorofilin miqdarında isə 10 gün ərzində 14% azalma müşahidə edilmişdir. Digər seçilmiş nümunə yenə *var.lutescens* növmüxtəlifliyinə aid olmaqla, nümunədə 30 sünbülündəki dənin sayı 1114 ədəd,




**Şəkil 1.** Yumşaq buğda sort və növmüxtəlifliklərinin genetik variasiyası

**Cədvəl 2.** Çoxölçülü analiz üsulu ilə seçilmiş genotiplər, Abşeron, 2013

| Sortun adi və genbank nömrəsi | Növ müxtəlifliyi | Toplanıldığı yer | Biokütlə, qr | 30 sünbüldəki dənin sayı, (ədəd) | 1000 dənin kütləsi,qr | Sünbül əmələgəlməyə qədərki günlərin sayı, gün | Fizioloji yetişkənliyə qədərki günlərin sayı, gün | Dən dolma mərhələsinin davametmə müddəti, gün | Xlorofilin miqdarı 11 May | Xlorofilin miqdarı 21 May |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| 7319 | var. meridionale | Naxçıvan | 5,974 | 1054 | 28 | 173 | 182 | 38 | 46,8 | 45 |
| 7052 | var. lutescens | Qobustan | 8,018 | 754 | 34 | 174 | 183 | 41 | 55,4 | 47,4 |
| 6300 | var. lutescens | Abşeron | 7,544 | 1114 | 35 | 168 | 181 | 38 | 47,1 | 34,6 |
| 9530 | var. erythrospermum | Şəki | 13,736 | 994 | 42 | 170 | 181 | 39 | 41 | 40,4 |
| 6280 | var. lutescens | Abşeron | 8,256 | 1114 | 36 | 170 | 180 | 38 | 50,1 | 49,4 |
| 7248 | var. milturum | Dəvəçi | 10,654 | 1054 | 45 | 169 | 179 | 41 | 52,7 | 46,4 |
| Günəşli | - | - | 9,394 | 934 | 35 | 166 | 178 | 34 | 48,6 | 44,9 |
| 7255 | var. erythrospermum | Goranboy | 10,01 | 1114 | 40 | 171 | 181 | 41 | 50 | 40,4 |
| Qırmızı buğda | - | - | 6,072 | 934 | 34 | 165 | 178 | 34 | 46,5 | 45 |
| 9525 | var. erythrospermum | Qarayazı | 9,942 | 1024 | 35 | 173 | 181 | 38 | 49 | 45,7 |
| 7046 | var. albidum | Qobustan | 6,934 | 1024 | 33 | 169 | 180 | 40 | 56,2 | 53,9 |
| Şəki 1 | - | - | 8,294 | 624 | 39 | 162 | 178 | 33 | 44,4 | 45,4 |
| 7246 | var. graecum | Naxçıvan | 7,002 | 964 | 34 | 174 | 183 | 39 | 46,6 | 44,9 |
| 6297 | - | Abşeron | 8,546 | 724 | 38 | 170 | 181 | 39 | 53,7 | 45,7 |
| 6279 | var. ferrugineum | Abşeron | 10,046 | 1024 | 42 | 169 | 181 | 36 | 49 | 45,3 |
| 6277 | var. lutescens | Abşeron | 7,924 | 934 | 35 | 174 | 182 | 38 | 54 | 53,8 |
| 6920 | var. graecum | Samux | 7,754 | 904 | 31 | 171 | 182 | 41 | 44,6 | 50,6 |
| 6168 | var. albidum | Tərtər | 8,426 | 964 | 41 | 173 | 183 | 37 | 55,6 | 54,5 |
| Pərzivan 2 | - | - | 13,64 | 814 | 39 | 164 | 178 | 35 | 43,3 | 39,9 |
| 9529 | var. erythrospermum | - | 12,57 | 1024 | 40 | 169 | 180 | 39 | 47,1 | 44,2 |

1000 dəninin kütləsi isə 35 q olmuşdur. Xlorofilin miqdarının 11 may tarixində 47.1, 21 may tarixində isə 34.6 olduğu qeyd edilmişdir. Göründüyü kimi, bu nümunədə xlorofilin miqdarında əvvəlki nümunələrdən fərqli olaraq, kəskin azalma (26.5%) müşahidə edilsə də, sünbüldə dənin sayının maksimum həddə, 1000 dənin kütləsinin isə yüksək olduğuna görə ən yaxşı 20 nümunə sırasına daxil edilmişdir. Seçilən nümunələrdən dördüncüsü Şəkidən toplanılmış və *var.eritrospermum* növmüxtəlifliyinə aiddir.

Həmin nümunədə 10 gün ərzində xlorofilin miqdarında cəmi 1.47% azalma qeydə alınmış və bu göstəriciyə əsasən ən yaxşı nümunələrin arasında yer almışdır. Məlumdur ki, xlorofil miqdarın-da baş verən kəskin azalma istilik stresinə həssaslığın əsas göstəricilərindən biri hesab edilir, bununla belə, çoxölçülü analiz üsulunda təkcə davamlılıq deyil, həm də digər parametrlərin yüksək və sabit göstəriciyə malik olması əsas rol oynayır. Bütün və ya əksər parametrlərə görə üstün və sabit olan nümunə ideal genotip adlanır. Seçilən nümunələrdən ən yaxşı göstəricilərə malik olanlardan biri Abşeron mənşəli *var.lutescens* növmüxtəlifliyinə aid genotipdir. Qeyd edilən nümunədə 30 sünbüldəki dənlərin sayı 1114 ədəd, min dənin kütləsi 36 q, xlorofilin miqdarında baş verən azalma isə cəmi 1.4 % təşkil etmişdir. Dəvəçi rayonundan toplanılmış və var.*milturum* növmüxtəlifliyinə aid nümunəni fərqləndirən əsas göstərici isə 1000 dənin kütləsi (45 q) olmuşdur. Bu, öyrənilən kolleksiyada ən yüksək göstəricidir.

Qeyd edildiyi kimi, tədqiqat işində genbank nümunələri ilə yanaşı, 10 yumşaq buğda sortu da öyrənilmiş, onlar arasından Günəşli, Qırmızı buğda, Şəki 1 və Pərzivan 2 sortları üstün parametrlərinə görə seçilmişdir. Həmin nümunələr kompleks şəkildə qiymətləndirildikdən sonra terminal istiliyə davamlı və ən geniş genetik variasiyaya malik olan nümunələr seleksiya proqramlarında istifadə olunacaqdır.

**Seçkin G. (**2011) Bağcılıkta kullanılan farklı amerikan asma anaçlarının yaprak klorofil yoğunluklarının (SPAD) belirlenmesi, Uluslararası Katılımlı I. Ali Numan Kıraç Tarım Kongresi ve Fuarı 27-30 Nisan.

**Hajiyev E., Akparov Z., Abilov Z., Abbasov M., Khalikulov Z., Sharma R.C.** (2013) Comparative Analysis of Gene bank Accessions and Improved Varieties of Durum in Azerbaijan. Int. Symp.: Genetics and Breeding of Durum Wheat. Rome (Italy), 27-30 May, p. 88.

**Camejo D.** (2005) High Temperature Effects on Photosynthetic Activity of Two Tomato Cultivars with Different Heat Susceptibility, J. Plant Physiol., **162:** 281-289,

**Crafts- Brandner S.J.** (2000) Rubisco Activase Constrains the Photosynthetic Potential of Leaves at High Temperature and $CO_2$, Proc. Natl. Acad. Sci. USA, **97:** 13430-13435.

**Inada K.** (1965) Studies on a method for determining the deepness of green color and chlorophyll content of intact crop leaves and its practical applications. 2. Photoelectric characters of chlorophyllometer and correlation between the reading and chlorophyll content in leaves. Proc. Crop Sci. Soc. Japan **33:** 301- 308

**Minolta Camera Co.** (1989) Ltd., Manual for chlorophyll meter SPAD 502. Minolta, Radiometric Instruments Div., Osaka, Japan.

**Reynolds M.P., Singh R.P., Ibrahim A., Ageeb O.A.A., Larque´-Saavedra A., Quick J.S.** (1998). Evaluating physiological traits to complement empirical selection for wheat in warm environments. Euphytica, **100:** 85–94.

**Stone P.J.** (1995) A survey of the effects of high-temperature during grain filling on yield and quality of 75 wheat cultivars. Aust. J. Agr. Res., **46:** 475-492.

**Stone P.J., Nicolas M.E.** (1995) Effect of timing of heat stress during 1205 grain filling on two wheat varieties differing in heat tolerance. 1. Grain growth. Aust. J. Plant Physiol., **22:**927–934.

**ƏDƏBİYYAT**

## Оценка Зноевыносливости Генотипов Мягкой Пшеницы (*Triticum aestivum* L.) Азербайджана С Помощью Многомерных Статистических Анализов

**Е.С.Гаджиев, Р.Т.Алиев**

*Институт генетических ресурсов НАНА*

В статье приведены результаты сравнительной оценки 10 сортов и 100 генотипов мягкой пшеницы из Национального Генбанка по 11-ти параметрам. С помощью многомерного статистического анализа выявлено, что материалы Генбанка по сравнению с районированными и перспективными сортами имеют более широкую генетическую вариацию. На основании полученных результатов выделено 20

генотипов, отличающихся наивысшими показателями и большей устойчивостью. Анализ показал, что у образцов наибольшие различия наблюдались по числу зерен в 30 колосьях, массе 1000 зерен и по количеству хлорофилла. Согласно комплексным показателям, кроме материалов Генбанка к выделенным 20 генотипам относились также сорта Гюнешли, Кырмызы бугда, Шеки 1 и Парзиван 2. Выделенные генотипы рекомендованы как исходный материал для получения устойчивых к высоким температурам сортов.

***Ключевые слова:*** *Triticum aestivum* L., *сортаизменчивость, многомерный статистический анализ, высокие температуры*

**Assessment of Resistance of Azerbaijan Bread Wheat Genotypes To Terminal Heat Stress Using GGE Biplot Analysis**

**E. S. Hajiyev, R.T.Aliyev**

*Institute of Genetic Resources, ANAS*

The article presents the results of the comparative evaluation of 10 varieties and 100 genotypes of bread wheat for 11 parameters. GGE biplot analysis based on multiple traits revealed that the Genebank accessions compared with realized and promising varieties had a wide variation. As a result of the statistical analysis 20 accessions have been selected that are highly resistant to terminal heat and have high values for studied traits. More differences between genotypes were observed in the number of grains in 30 spikes, mass of 1000 grains and chlorophyll amount. Among 20 accessions with complex indices, along with genebank accessions there were promising varieties as Guneshli, Gyrmyzy bugda, Sheki-1 and Parzivan-2. The use of selected accessions as a starting material in creation of resistant varieties is recommended.

***Key words:*** *Triticum aestivum* L., *diversity, GGE biplot analysis, terminal heat*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 97-103 (2014)*

# Azərbaycanda Sarı Pas (*Puccinia striiformis* West) Törədicilərinin Yumşaq Buğda Sortlarının İnkişaf Dinamikası, Morfofizioloji Xüsusiyyətləri, Dənin Keyfiyyət Göstəriciləri Və Məhsuldarlığına Təsiri

**E.R. İbrahimov[1]*, C.M. Təlai[1], S.M.Rüstəmova[2], İ.M. Hüseynova[2], C.Ə. Əliyev[1,2]**

[1] *KTN ET Əkinçilik İnstitutu, Pirşağı qəsəbəsi, 2 saylı sovxoz, Bakı AZ1098, Azərbaycan;*
*E-mail: ehtibar_i@yahoo.com*
[2] *AMEA Botanika İnstitutu, Badamdar şossesi, 40, AZ1073, Azərbaycan*

**Sarı pas xəstəliyinin Abşeron və Tərtər BTS-də yumşaq buğda (*Tricticum aestivum* L.) sortlarına təsiri tədqiq edilmişdir. Xəstəliyin sirayətlənmə dərəcəsindən və vegetasiya fazasından asılı olaraq yarpağın assimlasiya səthi və quru biokütləsinin, fotozintezin intensivliyinin azalması müşahidə edilmişdir. Eyni zamanda dənin keyfiyyət göstəriciləri və sortların məhsuldarlığı aşağı düşmüşdür.**

***Açar sözlər:*** *Tricticum aestivum* L.*, sarı pas, fotosintezin intensivliyi, assimilyasiya səthi, quru biokütlə, məhsuldarlıq, ras tərkibi, davamlılıq genləri*

## GİRİŞ

Taxıl məmulatları dünyada ən böyük sərvət və taxılçılıq isə iqtisadiyyatın aparıcı sahələrindən biridir. Son illərdə dünya bazarında dənli bikilərin qiymətinin durmadan artması ilə bağlı ölkədə ərzaq təhlükəsizliyinin təminatı diqqət mərkəzinə çəkilmişdir. 1999-cu ildən başlayaraq kənd təsərrüfatı məhsulları istehsalçılarının torpaq vergisi istisna olunmaqla digər vergilərdən azad edilməsi, eləcə də istifadə olunan yanacaq və mineral gübrələrə görə kompensasiyaların verilməsi, buğda əkinlərinə subsidiyaların ayrılması son illərdə taxılçılığa marağı xeyli artırmış, 2012-ci ildə respublikada 2 mln. 700 min ton taxıl istehsal edilmişdir. Yaxın gələcəkdə əhalinin çörəyə, heyvandarlığın yemə olan tələbatını təmin etmək üçün respublikada taxıl istehsalının 3,0 mln. tona çatdırılması üçün real imkanlar vardır.

Taxılçılığa ziyan vuran bir sıra amillər mövcuddur. Azərbaycanda buğda bitkisinin məhsuldarlığını aşağı salan əsas amillərdən biri də qonur və sarı pas, unlu şeh, sürmə, septoriya, helmintosporioz, fuzarioz və s. xəstəlik törədiciləridir. Sarı pas respubilkanın taxılçılıqla məşğul olan əksər bölgələrində dəfələrlə kütləvi yayılmaqla, dənin keyfiyyətinin və məhsuldarlığın 20-60%) kəskin aşağı düşməsinə səbəb olur. Sarı pasın məhsuldarlığa vurduğu ziyan bir tərəfdən davamlı sortların müdafiə mexanizminin itirilməsi, digər tərəfdən isə xəstəliyin hər il kütləvi şəkildə yayılması ilə əlaqədar olmuşdur (İbrahimov, 2005).

Bitkilərin məhsuldarlığı vegetasiya müddətində fotosintetik aparatın fəaliyyətindən əhəmiyyətli dərəcədə asılıdır. Ontogenezdə bioloji kütlənin artım dinamikası sortların fizioloji xüsusiyyətlərindən, inkişaf fazalarından və ətraf mühit amillərinin təsirindən asılıdır (Mirzəyev, 2006).

Bitkilərin xəstəliklə yoluxması fizioloji funksiyaların pozulmasına, tənəffüsün intensivliyinin sürətlənməsinə səbəb olur ki, bu da məhsulun azalması ilə nəticələnir. Xəstəliyin təsirindən bitkilərdə assimilyasiya səthinin azalması və məhsuldarlığın aşağı düşməsi də bir çox tədqiqatlarda öz əksini tapmışdır (Кершанская, 2000). Patogenin təsirindən xloroplastların quruluşunda da struktur pozuntuları müşahidə edilir (Cahangirov və b., 2010).

Məlumdur ki, xəstəliyə davamlı və davamsız bitkilər bir-birindən antigenlərə görə fərqlənsələr də parazit və sahib bitki zülalları arasında immunoloji yaxınlıq olmalıdır (Mirzəyev, 2006).

Təqdim olunan məqalədə ET Əkinçilik İnstitutunun Abşeron Təcrübə Bazasında sarı pas xəstəliyinin yumşaq buğda genotiplərinin inkişaf dinamikasına, morfofizioloji, məhsuldarlıq və keyfiyyət göstəricilərinə təsiri öyrənılmışdır.

## MATERİAL VƏ METODLAR

Tədqiqatın materialı kimi Azərbaycan ET Əkinçilik İnstitutunda müxtəlif illərdə yaradılmış yüksək məhsuldar yerli yumşaq buğda sortları, ***İCARDA, CİMMYT*** və digər beynəlxalq seleksiya mərkəzlərindən introduksiya olunmuş 7000-dən artıq genotip götürülmüşdür. Sortlarda davamlılıq və həssaslıq səviyyəsi Kobb və Zadoks metodu (***ICARDA***) əsasında aparılmışdır (Jonson et al., 1988). Sarı pas xəstəliyinin törədicilərinin populyasiya tərkibinin müəyyən edilməsi R.Jonson, R.W.Stubbs, E.Fuchs və N.H.Chamberlay tərəfindən tərtib olunmuş şkala əsasında öyrənilmişdir (Шелепов и др., 2004). Fotosintezin intensivliyi URAS-2T ("Xartman and Braun", Almaniya) infraqırmızı qaz analizatoru vasitəsilə təyin edilmişdir. Dənin keyfiyyət göstəricilərinin analizi institutun

"Dənin keyfiyyəti" laboratoriyasında ümumi qəbul olunmuş "Dənin keyfiyyətinin qiymətləndirilməsi üzrə metodiki göstərişlər" əsasında aparılmışdır (Методические рекомендации по оценке качества зерна, 1977).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Pas xəstəliyinin buğda bitkisində fotosintezin intensifliyinə təsirini öyrənmək məqsədi ilə sünbülləmə fazasından mum yetişkənliyi fazasına qədər mütəmadi olaraq ölçülmələr aparılmışdır. Bunun üçün aşağıdakı sortlar seçilmişdir: Əkinçi-84–sarı pas xəstəliyinə həssas; Qiymətli 2/17–sarı pas xəstəliyinə orta həssas; Qırmızı gül 1–sarı pas xəstəliyinə davamlı, qonur pasa həssas; Əzəmətli-95–hər iki pasa davamlı (Cədvəl 1). Assimilyasiya olunan $CO_2$-nın miqdarı sortların xəstəliklə sirayətlənmə dərəcəsindən asılıdır, başqa sözlə, xəstəliyn yoluxma səviyyəsi artdıqca fotosintezin intensivliyinə təsir də artır. Belə ki, sünbülləmə fazasında assimilyasiya olunan $CO_2$-nın miqdarı Əkinçi-84 sortu sarı pasa 10MS səviyyəsində yoluxduğu halda 14%, Qiymətli-2/17 sortu 5MS səviyyəsində yoluxğu halda isə 9% sağlam variantdan aşağı olmuşdur. Çıçəkləmə fazasında Əkinçi-84 sortu sarı pasa 20MS səviyyəsində sirayətləndiyi zaman fotosintezin intensivliyi sağlam bitkilərlə müqayisədə 28%, Qiymətli 2/17 sortu 20MS olduqda isə azalma 22% təşkil etmişdir.

Dənin formalaşması fazasında $CO_2$-nın assimilyasiya intensivliyi Əkinçi-84 sortu sarı pasa 20S səviyyəsində yoluxduğu halda 39%, Qiymətli 2/17 sortu 40MS səviyyəsində yoluxğu halda isə 31%, süd yetişmə fazasında Əkinçi-84 sortu sarı pasa 30S səviyyəsində yoluxduğu halda 45%, Qiymətli 2/17 sortu 20S səviyyəsində yoluxğu halda isə 43% sağlam variantdan aşağı olmuşdur. Mum yetişkənliyi fazasında zamanı temperaturun artması ilə əlaqədar sarı pas xəstəliyinin inkişafı dayanır və qonur pas xəstəliyi sürətlə inkişaf etməyə başlayır. Bu fazada qonur pas xəstəliyi Qırmızı gül-1 sortunu 40S səviyyəsində yoluxduraraq fotosintezin qiymətində kəskin azalma - 67%, Əkinçi-84 sortunda (50S) 62% və Qiymətli 2/7 sortunda isə (20S) 46% müşahidə edilmişdir.

Xəstəlik dənin dolmasına təsir edərək sonda Əkinçi-84 sortunda 40%-ə yaxın, Qiymətli 2/17 sortunda isə 10%-ə qədər məhsuldarlığın azalmasına səbəb olmuşdur. Qırmızı gül-1 sortu, adətən vegetasiyanın sonuna yaxın xəstəliklə sirayətləndiyi üçün, xəstəliyin məhsuldarlığa təsiri əif olur. Qeyd etmək lazımdır ki, sarı pas xəstəliyi qonur pasa nisbətən məhsuldarlığa daha çox təsir edir ki, bu da törədicinin bitkilərin inkişafının ilkin fazalarından yoluxması və mum fazasına qədər fəal olması ilə bağlıdır.

Sarı pasa həssaslığına görə fərqlənən Tərəqqi sortunda müxtəlif fenofazalarda (sünbulləmə, süd yetişkənliyi, mum yetişkənliyi), xəstəliyin təsiri daha ətraflı öyrənilmişdir. Sarı pas xəstəliyi bitkidə digər morfofizioloji proseslər kimi, yarpaqların assimilyasiya səthinə və quru biokütlənin toplanmasına əsaslı təsir göstərir. Belə ki, Tərəqqi sortunda sünbülləmə fazasında assimilyasiya səthi sağlam bitkilərdə 78 $sm^2$, xəstə bitkilərdə 76 $sm^2$, olmaqla fərq 2,5% olmuşdur. Süd yetişmə faza- sında sağlam bitkilərdə 56 $sm^2$, xəstə bitkilərdə 44 $sm^2$ olmaqla fərq 21,4% və mum fazasında sağlam və xəstə bitkilərdə uyğun olaraq 25 $sm^2$ və 14 $sm^2$ olmaqla assimilyasiya səthini 44% azaltmışdır (Şəkil 1).

**Cədvəl 1.** Ontogenez zamanı buğda sortlarının sarı pas xəstəliyinə yoluxma dərəcəsindən asılı olaraq fotosintezin intensivliyinmin dəyişməsi

| Sort | variant | İnkişaf fazaları | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | Sünbülləmə | | Çiçəkləmə | | Dənın formalaşması | | Süd yetişkənlik | | Mum yetişkənlik | |
| | | Sarı pas | Fİ. $qCO_2/dm^2\cdot saat$ | Sarı pas | Fİ $mqCO_2/dm^2\cdot saat$ | Sarı pas | Fİ $mqCO_2/dm^2\cdot saat$ | Sarı pas | Fİ $mqCO_2/dm^2\cdot saat$ | Qonur pas | Fİ $mqCO_2/dm^2\cdot saat$ |
| Əkinçi 84 | I | 10MS | 18 | 20MS | 18 | 20S | 16 | 30S | 12 | 50S | 6 |
| | II | R | 21 | 5R | 25 | 5MR | 26 | 5MR | 22 | 10MR | 16 |
| Qiymətli 2/17 | I | 5MS | 20 | 20MS | 19.5 | 40MS | 18 | 20S | 13 | 20S | 7 |
| | II | R | 22 | 5MR | 25 | 10MR | 26 | 5MR | 23 | 10MR | 13 |
| Qırmızı gül1 | I | R | 21 | R | 24 | R | 26 | R | 29 | 40S | 6 |
| | II | R | 21 | R | 24 | R | 26 | R | 29 | 5MR | 18 |
| Əzəmətlı 95 | I | R | 22 | R | 26 | R | 28 | R | 26 | R | 18 |
| | II | R | 22 | R | 26 | R | 28 | R | 26 | R | 18 |

***Qeyd:*** I- təbii fon (xəstə), II- preparat çilənmiş (sağlam), Fİ-fotosintezin intensivliyi, R-xəstəliyə davamlı, MR- xəstəlıyə oreta davamlı, MS-xəstəliyə orta həssas, S-xəstəliyə həssas.




**Şəkil 1.**Tərəqqi sortunda sarı pas xəstəliyinin təsirindən assimilyasiya səthinin dəyişməsi (I - təbii fon (xəstə), II - sağlam)




**Şəkil 2**. Sarı pas xəstəliyinin Tərəqqi sortunda quru biokütlənin toplanmasına təsiri.

Sarı pas xəstəliyinin quru biokütlənin toplanmasına təsiri şəkil 2-də verilmişdir. Şəkildən göründüyü kimi, sünbülləmə fazasında sağlam bitkilərdə bu göstərici 265 mq, xəstə bitkilərdə isə 295 mq olmaqla 9 % tərtibində fərqlənmişdir. Süd yetişmə fazasında quru biokütlənin toplanması sağlam bitkilərdə 260 mq, xəstə bitkilərdə isə 190 mq olmaqla fərq 27% və mum fazasında sağlam bitkilərdə 248 mq, xəstə bitkilərdə isə 150 mq olmaqla 40% təşkil etmişdir. Beləliklə, sarı pasın quru biokütləyə ən çox təsiri mum yetişmə zamanı özünü göstərmişdir.

Süd yetişkənliyi fazasında fərqlər artaraq assimilyasiya səthi üçün 21,4%, quru biokütlə üçün isə 27% təşkil etmişdir (Şəkil 2). Vegetasiyanın sonuna doğru bitkinin xəstəliyə sirayətləməsi şiddətlənmiş və nəticələr arasında fərq artmışdır. Müəyyən olunmuşdur ki, sarı pas xəstəliyinin təsirindən mum yetişkənliyi fazasında assimilyasiya səthlərii arasında fərq 44%, quru biokütlə arasında fərq isə 40 % olmuşdur. Fotosintezin intensivliyinə təsir digər sortlarda müxtəlif fazalarda ən aşağı - 9%, ən yüksək isə 70%-ə yaxın olmuşdur.

Sarı pas xəstəliyinin buğda bitkisini yolux-durma dərəcəsindən asılı olaraq məhsuldarlıq 60,0%-ə qədər aşağı düşə bilir (Şəkil 3). Bunları nəzərə alaraq seleksiyada yeni sortların yaradılmasında hibridləşmə zamanı ilkin material kimi valideynlərin seçilməsində davamlı formalara üstünlük verilməsi məqsədəuyğun hesab edilir. Hər bir xəstəliyin məhsuldarlığa mənfi təsirinin müəyyən edilməsi, ayrı-ayrı sortların bu xəstəliklərə davamlılıq səviyyəsini öyrənməyə və təsərrüfat şəraitində ona qarşı mübarizə tədbirlərinin daha səmərəli aparılmasına kömək edir. Sarı pas xəstəliyinin rayonlaşmış və perspektiv yumşaq buğda sortlarının məhsuldarlığına vurduğu ziyanı müəyyən etmək üçün ekoloji cəhətdən fərqli Abşeron və Tərtər Bölgə Təcrübə Bazasında suvarma şəraitində tədqiqatlar aparılmışdır. Standart kimi, davamsızlığına görə seçilən Morokko sortundan istifadə edilmişdir. Təcrübələr infeksiya və süni sirayətləndirmə fonunda 1$m^2$ sahədə 3 təkrarda qoyulmuş və sarı pasa qarşı 25%-li Bayleton (0,6 kq/ha) və 25%-li Tilt (0,5 l/ha) preparatlarından istifadə olunmuşdur.




**Şəkil 3**. Sarı pasın təsirindən buğda bitkisində fotosintetik parametlərin və məhsuldarlığın dəyişməsi.

Müəyyən edilmişdir ki, vegetasiya zamanı sarı pasın məhsuldarlığa vurduğu ziyanın miqyası buğdaların inkişaf fazası ilə bağlıdır, daha dəqiqi, xəstəlik nə qədər tez əmələ gəlirsə, məhsul itkisi də bir o qədər çox olur. Müşahidələr göstərmişdir ki, Abşeron şəraitində xəstəlik çox erkən – martın ortalarında (kollanmanın sonu) başlandıqda dəyən 3 illik orta ziyanın miqdarı, ayrı-ayrı sortlar üzrə 22-80% arasında dəyişdiyi halda, xəstəliyin daha gec–aprel, may aylarında (sünbülləmə və çiçəkləmə mərhələsi) başlandığı Tərtər BTS-də itki xeyli az (13-59%) olmuşdur .

Öyrənilən sortlar arasında 3 illik nəticələrə görə, Abşeronda Qiymətli -2/17 (6,9 t/ha), Tərtərdə isə Azəri (6,4 t/ha) sortları nəzarət olunan varianta nisbətən daha yüksək məhsuldarlığa malik olmuşlar. Abşeron şəraitində Qiymətli- 2/17 sortunda sarı pasın 3 illik orta göstəricilərinə görə zərərvurma həddi xeyli aşağı (35S) olduğu halda, Azəri sortunda (Tərtər) bu göstərici 70S arasında dəyişmişdir. Məhsuldarlığa görə fərqlənmiş Əkinçi-84 və digər yumşaq buğda sortlarında da sarı pasın intensivliyi yuxarı səviyyədə olmuşdur (60-70S). Qiymətli- 2/17 və Azəri sortları sarı pasla yüksək səviyyədə sirayətlənməsinə baxmayaraq, onlar stabil məhsul vermə qabiliyyətini saxlaya bilmişlər. Marokko sortunda bu göstərici Abşeronda 0,78 t/ha, Tərtər BTS-da isə 2,1 t/ha olmuşdur. Öyrənilən sortların nəzarət variantlarında sarı pasın zərərvurma həddi digərləri ilə müqayisədə Mirbəşir-128 sortunda daha yüksək (80S) olmuşdur. Bu fərq hər iki bölgədə məhsuldarlıqda da (26,6-38,1%) özünü göstərmişdir. Mirbəşir-128 sortunun təbii şəraitdə sarı pasa davamlılığının çox aşağı olması onun əkin sahəsinin məhdud olması ilə bağlıdır –hazırda bu sort yalnız respublikanın şimal bölgəsində becərilir.

Sarı pas xəstəliyinin Abşeronda məhsuldarl-ı-ğa təsirinin faizlə miqdarına nəzər yetirdikdə, bu göstərici yenə də Mirbəşir-128 sortunda digərlərindən fərqlənir (3 illik orta 38,2%). Məhsula dəyən ziyanın faizlə miqdarı Qiymətli-2/17 və Əkinçi-84 sortlarında xeyli aşağı (22,0–23,8%) olmuşdur. Standart Marocco sortunda isə məhsul itkisi 80,1% olmuşdur. Analoji nəticələr Tərtər BTS-də alınmışdır.

Sarı pas xəstəliyinin toxumun cücərmə qabiliyyətinə təsiri əhəmiyyətsiz səviyyədə olmuşdur. Lakin xəstəliyə məruz qalmış dənlərdən əmələ gəlmiş cücərtilərin kökboğazı olduqca nazik və tutqun boz rəngdə olub, boyu sağlamlara nisbətən qısa olmuşdur.

Qeyd etmək lazımdır ki, sınaqdan çıxarılan hər iki preparat sarı pas xəstəliyinin qarşısının alınmasında yüksək effektliyə malikdirlər. Bəzi hallarda Tilt preparatlarına nisbətən Bayleton çilənmiş sort nümunələrində preparatın təsiri bir qədər zəif olmuşdur. Məsələn, Tilt çilənmiş bütün sortlarda sarı pasın inkişafı 5-10 MR səviyyəsində olduğu halda, Bayleton çilənmiş Mirbəşir-128, Azəri və Marokko sortlarında 10-15 MS səviyyəsində olmuşdur. Lakin preparatlar arasında eyni sort daxilində məhsuldarlığa görə önəmli fərq müşahidə edilməmişdir. Hətta bəzi hallarda Bayleton çilənmiş variantlarda məhsuldarlıq nisbətən yuxarı (Qiymətli-2/17, Azəri) olmuşdur.

Məhsuldarlıqla yanaşı, sarı pas xəstəliyi dənin keyfiyyətinə də təsir göstərir. Bir çox tədqiqatçıların fikrinə görə, məhsuldarlığı aşağı olan nümunələrin dənində zülalın miqdarı, yüksək məhsuldarlığa malik sortnümunələrinə nisbətən üstünlük təşkil edir (Həsənova və b., 2007). Tədqiqatlarımız göstər-mişdir ki, sarı pas xəstəliyi bitkilərin kəmiyyət göstəriciləri ilə yanaşı, dənin keyfiyyətinə də əhəmiyyətli dərəcədə təsir edir. Sarı pasın buğdanın keyfiyyət göstəricilərinə təsirini müəyyən etmək üçün biz respublikada rayonlaşdırılmış 4 yumşaq buğda sortu üzərində təcrübə aparmışıq. Bu məqsədlə həmin sortlar süni olaraq sarı pas sporları ilə sirayətləndirilmiş və sağlam, yəni funqisidlə işlənmiş variantla müqayisədə tədqiq edilmişdir (Cədvəl 2).

**Cədvəl 2.** Sarı pasla sirayətlənmənin yumşaq buğda sortlarının keyfiyyət göstəricilərinə təsiri.

| S. s. | Sortlar | Sarı pas | Kleykovi-na, %-lə | Kleykovinanın deformasiya əmsalı, (KDƏ) | Sedimen-tasiya, ml | 1000 dənin kütləsi, q |
|---|---|---|---|---|---|---|
| 1 | Tərəqqi (sağlam) | 20 MR | 30,0 | 101,9 | 21,0 | 42,3 |
| 2 | Tərəqqi (xəstə) | 70 S | 21,6 | 96,8 | 21,0 | 21,6 |
| 3 | Mirbəşir-128 (sağlam) | 10 MR | 15,8 | 89,8 | 21,0 | 40,0 |
| 4 | Mirbəşir-128 (xəstə) | 50 S | - | - | 21,0 | 23,6 |
| 5 | Əkinçi-84 (sağlam) | 10 MR | 20,8 | 100 | 12,0 | 44,0 |
| 6 | Əkinçi-84 (xəstə) | 30 S | 20,4 | 97,4 | 12,0 | 29,6 |
| 7 | Qiymətli-2/17 (sağlam) | 10 MR | 27,2 | 97,0 | 15,0 | 47,0 |
| 8 | Qiymətli-2/17 (xəstə) | 25 S | 16,0 | 90,2 | 15,0 | 33,0 |

Öyrənilən sortlar daha çox mum yetişkənliyi dövründə sarı pasla sirayətlənmiş və onların hər birinin dən keyfiyyətinə xıstılik müxtəlif formada təsir etmişdir. Cədvəl 2-dən göründüyu kimi, sağlam və xəstə nümunələrdə kleykovinanın miqdarı arasındakı fərq nəzərə çarpacaq dərəcədə olmuşdur.

Tərəqqi sortunun sarı pasla sirayətlənmiş variantında sağlam varianta nisbətən kleykovinanın miqdarı 8,4%, 1000 dənin kütləsi 20,7 q az olmuşdur. Kleykovinanın deformasiya əmsalı (KDƏ) isə hər iki halda variantlar arasında fərq az olmasına baxmayaraq, eyni kateqoriya hüdudlarından kənara çıxmamışdır. Sarı pasla sirayətlənmənin sedimentasiya göstəricisinə təsiri müşahidə edilməmişdir. Mirbəşir-128 sortunda variantlar arasındakı fərq müvafiq olaraq 15,8%, 16,4 q, Qiymətli-2/17 sortunda 11,2%, 14,0 q olmuşdur. Əkinçi 84 sortunda isə variantlar arası fərq yalnız 1000 dənin (14,4 q) kütləsində müşahidə edilmişdir.

Ümumən, sortlar sarı pasla sirayətləndikdə çörəkbişirmə keyfiyyətinin göstəricisi olan sedimentasiya əmsalı dəyişməmiş, dənin kütləsi və kleykovinanın miqdarı isə aşağı düşmüşdür.

Kleykovinanın deformasiya əmsalında da kəskin dəyişiklik müşahidə edilməmişdir. Beləliklə, aparılmış tədqiqatlar nəticəsində müəyyən edilmişdir ki, sarı pasın buğda bitkisinin keyfiyyət göstəricisinə təsiri, xəstəliyin intensivliyindən və sortların tolerantlıq səviyyəsindən asılı olaraq müxtəlif olsa da, bir qayda olaraq kleykovinanın miqdarı və 1000 dənin kütləsi bu təsirə daha cox məruz qalır. KDƏ göstəricisi nisbətən aşağı düşsə də, bu fərq eyni keyfiyyət kateqoriyası hüdudlarından kənara çıxmır. Qeyd etmək lazımdır ki, sarı pas xəstəliyi ayrı-ayrı genotiplərin keyfiyyət göstəricilərinə fərqli təsir göstərmişdir. Belə ki, Əkinçi-84 sortu sarı pasa sirayətlənsə də (30S), keyfiyyət göstəriciləri aşağı düşməmişdir. Tərəqqi sortu da 70S dərəcəsində sirayətlənsə də, keyfiyyət göstəricilərini nisbətən saxlaya bilmişdir. Bu faktlar Əkinçi-84 və Tərəqqi sortlarının genetik olaraq bu xəstəliyə tolerantlığı–sirayətlənsə belə öz potensialını maksimal dərəcədə qoruyub saxlaması ilə ifadə olunur. Sarı pasla sirayətlənmə ən çox Mirbəşir-128 və Qiymətli-2/17 sortlarında müşahidə oplunaraq, dənin keyfiyyət göstəricilərini aşağı salmışdır.

Məlum olduğu kimi, xəstəlik törədicilərinin hər birinin morfoloji cəhətdən eyni quruluşa malik, lakin fizioloji xüsusiyyətləri ilə bir-birindən ciddi surətdə fərqlənən bir cox rasları mövcuddur. Bu raslar hər bir bölgənin təbii iqlim şəraitindən və bitki örtüyündən asılı olaraq müxtəlif səviyyədə yayılmaqla, ziyan vurma həddinə görə də bir-birindən fərqlənirlər. Buna müvafiq olaraq ayrı- ayrı bölgələrdə buğdanın sarı pas xəstəliyinin ras tərkibinin təyini və patogen rasların müəyyən edilməsi mövcud sortların bu bölgələrdə yerləşdirilməsinə və seleksiya yolu ilə hər bir bölgə üçün xəstəliyə davamlı və tolerant yeni sortların yaradılmasına imkan verir.

Hər bir xəstəliyə qarşı səmərəli mühafizə tədbirləri aparmaq və seleksiya işlərində xəstəliyə qarşı ilkin material kimi davamlı bitki nümunələrindən istifadə etmək üçün həmin xəstəliyin ras tərkibinin öyrənilməsi praktiki cəhətdən böyük əhəmiyyət kəsb edir. Buna görə də biz buğdanın sarı pas törədicilərinin ras tərkibini öyrənməyə çalışmışıq. Məlumdur ki, rasların təyinatı zamanı istixana şəraitində işığın çatışmaması və temperatur rejiminin pozulması sporların bitki üzərində inkişafına olduqca mənfi təsir göstərir. Pasın digər növləri (gövdə və qonur) ilə müqayisədə, sarı pasın sporları, qeyd edilən faktorlara qarşı daha çox həssasdırlar. Məsələn, əgər gövdə və qonur pas törədicilərinin inkişafı üçün 5-7 min lüks işıq lazım gəlirsə, sarı pasın inkişafı üçün 30-40 min lüks işıq tələb olunur (Яхьяуи др., 2003; Hussain et al., 2000)

Ilk dəfə olaraq Azərbaycanda bölgələr üzrə buğdanın sarı pas xəstəliyi törədicisinin ras tərkibi tədqiq olunmuş, *Puccinia striiformis West.* göbələyinin 6E6, 6E2, 2E0, 134E134, 70E6, 22E6, 14E142, 6E0, 134E150 rasları identifikasiya edilmiş və onların virulentlik səviyyəsi müəyyənləşdi-rilmişdir. Müəyyən edilmişdir ki, 14E142, 6E6, 142E150, 134E150 rasları Azərbaycanda becərilən əksər buğda sortları üzərində daha çox virulentliyə malikdirlər (İbrahimov, 2013).

Azərbaycanın taxılçılıq bölgələrində sarı pasın rasları eyni səviyyədə yayılmamışdır. Bəzi raslara əksər taxılçılıq bölgələrində rast gəlindiyi halda, digər rasların rast gəlmə tezliyi bir və ya iki bölgədə tamamlanmışdır. Nisbətən geniş yayılmış raslar

134E134, 6E6, və 134E150 raslarıdır. Onlara əksər taxılçılıq bölgələrində təsadüf olunur. Müəyyən edilmiş rasların bəziləri ancaq ayrı–ayrı bölgələrdə yayılmışlar. Məsələn:70E6 rası ancaq Abşeronda, 22E6 Qobustanda, 6E2 Şəkidə, 14E142 və 2E0 Tərtərdə, 6E0 rası isə ancaq Cəlılabadda aşkar edilmişdir. Təbii ki, sarı pasın raslarının ayrı-ayrı bölgələrdə müxtəlif səviyyədə yayılması respublikanın torpaq-iqlim şəraiti ilə bağlıdır. Bu xüsusiyyət dünyada olan 11 iqlim qurşağından 9-nun Azərbaycanda mövcud olması ilə şərtləndirilir. Taxılçılıq bölgələrimizin təbii iqlim şəraiti bu və ya digər səviyyədə bir-birindən fərqləndiyi kimi bu faktorlara olduqca həssas olan sarı pasın ras tərkibi də fərqlidir (İbrahimov, 2013). Şimali Qafqaz regionuna sarı pas ana populyasiyaların formalaşdığı Zaqafqaziya ərazisindən miqrasiya olunmuşdur. Uzun illərin müşahidələri zamanı bu infeksiya mənbəyində aşağıdakı əsas raslar qeydə alınmışdır:E0, 4E16, 5E0, 5E16, 6E0, 6E16, 7E0, 7E16 (Stubbs et al., 1985; Volkova, 2006).

Sarı pasın öyrənilməsində ən vacib məsələlərdən biri xəstəliyə davamlı genlərin müəyyən edilməsi və davamlı sortların alınmasında bu genlərin valideyn formalarının hibridləşmə işinə daxil edilməsidir. Xəstəliyə davamlı yeni effektiv genləri daşıyan genotiplərin (sortların) axtarışı və müəyyən edilməsi, eləcə də onların seleksiya proqramında geniş istifadə olunması ilə əlaqədar problemlərin həllini, mühüm bir vəzifə kimi qarşıya qoyulmuşdur. Bu sahədə aparılan tədqiqat işlərinin bir hissəsi İran İslam Respublikasının Bitkiçilik İnstitutunda laboratoriya şəraitində sarı pas xəstəliyinin ras tərkibinin öyrənilməsi zamanı məlum gen davamlılığına malik differensiator buğda genotipləri (18 ədəd) üzərində aparılmışdır. Laboratoriya şəraitində aparılan tədqiqatlar göstərmişdir ki, differensiator buğda genotipləri içərisində Yr3V, Yr4+, Yr1, Yr3N, YrSP, Yr5, YrCV və s. genlərin sarı pasın Azərbaycanda yayılmış bütün raslarına qarşı tam müqavimətliyi vardır.

Bu istiqamətdə aparılan tədqiqat işlərinin böyük bir hissəsi isə Əkinçilik İnstitutuna ***İCARDA*** xətti ilə daxil olmuş test sortlar (Tutucu pitomnik, 42 ədəd) əsasında respubilkanın torpaq-iqlim şəraitinə görə bir-birindən kəskin fərqlənən 4 müxtəlif bölgəsində: Şirvan (dəmyə), Düzən Qarabağ (suvarma), Cənubi Muğan (dəmyə) və Abşeron (suvarma) rayonlarında aparılmışdır. Təcrübələr bütün bölgələrdə infeksiya fonunda:Marokko və sarı pasa həssas digər sortların əhatəsində qoyulmuşdur. Sınaq təcürbələrinin əsas məqsədi respublika ərazisində təbii şəraitdə sarı pas epidemiyasının geniş yayıldığı taxılçılıq bölgələrində sarı pasın mövcud raslarına kompleks davamlı effektiv genlərin müəyyən edilməsi idi. Dörd il müddətində 4 bölgədə aparılan tədqiqatlar nəticəsində məlum olmuşdur ki, tutucu pitomnikində yerli şərait üçün Yr1; Yr3V; YrCV; YrSP; Yr15; Yr10; Yr3N; YrDW; Yr4+; Yr5 və YrSD genləri sarı pasa öz davamlılıqlarını uzun müddət saxlaya bilmişdir (İbrahimov, 2014).

Beləliklə, sarı pas xəstəliyi buğdada bir çox morfofizioloji əlamətlərə təsir etməklə, son olaraq məhsulun azalmasına səbəb olur. Bunu nəzərə alaraq yeni məhsuldar genotiplərin yaradılmasında ilkin seleksiya materialı kimi xəstəliklərə davamlı genotiplərin seçilməsi tövsiyə edilir.

## ƏDƏBİYYAT


**Cahangirov A.A., Təlai C.M., Həmidov H.N**. (2010) Müxtəlif torpaq iqlim şəraitində fizioloji xüsusiyyətlərinə görə fərqlənən buğda sortlarında fotosintez məhsuldarlığı. Azərbaycan Elmi-Tədqiqat Əkinçilik İnstitutunun Elmi Əsərləri, **XXII**: 142-145.

**Həsənova Q.M., Poladova G.H.** (2007) Yüksək məhsuldar sortların dən keyfiyyətinin artırılması yolları. Azərbaycan Aqrar Elmi, **4-5:** 17-18

**Hussain M., Rehman A., Hussain M., Muhammad F., Younis M., Malukra A.Q., Zulkiffal M.** (2007) A new high yielding durable rust resistance variety–Shafaq 06. Pakistan Journal of Phytopathology, **19 (12)**:238-142.

**İbrahimov E.R.** (2005) Sarı pasa davamlı buğda sortlarının yaradılması. Azərbaycan Elmi Təd-qiqat Əkinçilik İnstitutunun Elmi Əsərləri, **XXI**:162-164.

**İbrahimov E.R.** (2013) Azərbaycanda buğdanın sarı pasa (*Puccinia striiformis* west) effektiv davamlı genlərin müəyyənləşdirilməsi və seleksiyada istifadəsi. Bakı, a.e.ü.f.d.avtoreferatı.

**İbrahimov E.R.** (2014) Revealing and use of yellow resistance genes in wheat breeding programs in Azerbaijan. 2nd İnternational wheat stripe rust symposium. Regional Cereal Rust Research Center, Izmir, Turkey, 39.

**Jensen S. G**. (1968) Photosynthesis, respiration and other physiological relationships in barley infected with barley yellow draw virus. *Phytopathology*, **58 (2):**204-208.

**Jonson R**. (1988) Durable resistance to yellow rust in wheat and its implication in plant breeding. In: Breeding Strategies for Resistance to Rusts of Wheat (Eds.Simmonds N W and Rajaram S), CIMMYT, Mexico, 63-75.

**Jonson R., Stubbs R.W., Fuchs E., Chamberlain N.H**. (1972) Nomenclature for physiologic races of *Puccinia striiformis* infecting wheat. *Transactions of the British Mycological Socciety*, **58:** 475-480.

**Mirzəyev R.S.** (2006) Bəzi dənli–paxlalıbitkilərdə asssimilyasiya səthinin formalaşması və yerüstü

quru biokütlənin toplanması. Azərbaycan Aqrar Elmi, **9-10:**19-20.

**Stubbs R.W.** *(*1985) Stripe rust. Roelfs and W.R. Bushnell, eds. The Cereal Rusts Vol. II; Diseases, Distribution, Epidemiology, and Control. Academic Press, Orlando, 61-101.

**Volkova, G.** (2006) Stripe rust distribution, harmfulness and population structure in the North Caucasus Region. Third Regional Yellow Rust Conference for Central and West Asia and North Africa, Tashkent, Uzbekistan, p. 43.

**Кершанская О.И.** (2000) Фотосинтетические основы продукционного процесса у пшеницы. Алматы: Изд-во "Басбакан" ПА "КАЗГОР", с.245.

**Методические рекомендации по оценке качества зерна** (1977) М, 5-35.

**Федотова Т.И.** (1958) О нарастании поражаемости пшениц бурой ржавчиной с фазе колошения. Труды ВИЗР, **13:** 85.

**Шелепов В.С., Маласай В.В., Пензев В.М., Кочмарский А.Ф. (**2004) Качество зерна пшеницы. В кн. Морфология, биология, хозяйственная ценность пшеницы. Мироновка, 360-426.

**Яхьяуи А., Тораби М., Саидов М., Четин Л., Джунусова М., Хохлачева В., Кетата Х., Браун Х., Моргунов А.** (2003) Региональное сотрудничество с целью повышения устойчивости пшеницы к желтой ржавчине, Алматы, с. 20.

## Влияние Возбудителей Желтой Ржавчины (*Puccinia striiformis* West) На Динамику Развития, Морфофизиологические Особенности, Показателей Качества Зерна и Урожайность Мягких Сортов Пшеницы в Азербайджане

**Э.Р.Ибрагимов[1]*, Дж.М.Талаи[1], С.М.Рустамова[2], И.М.Гусейнова[2], Д.А.Алиев[1,2]**

*[1] Институт земледелия МСХ*
*[2] Институт ботаники НАНА*

Изучено влияние желтой ржавчины на сортов мягкой пшеницы (*Tricticum aestivum* L.) на Абшеронской и Тертерской ЗОС. Наблюдали уменьшение ассимиляционной поверхности, сухой биомассы и интенсивности фотосинтеза листа в зависимости от степени поражения растения возбудителем и фазы вегетации. Установлено понижение показателей качества зерна и урожайности изученных сортов.

***Ключевые слова:*** *Tricticum aestivum L., желтая ржавчина, интенсивность фотосинтеза, ассимиляционная поверхность, сухая биомасса, урожайность, расовый состав, гены устойчивости*

## Effect of Yellow Rust (*Puccinia striiformis* West) Causatives on Growth Dynamics, Morfological Features, Grain Quality and Yield of Bread Wheat Cultivars in Azerbaijan

**E.R.Ibrhimov[1], J.M. Talai[1], S.M.Rustamova[2], İ.M. Huseynova[2], J.A. Aliyev[1,2]**

*[1] Institute of Crop Husbandry, Ministry of Agriculture*
*[2] Institute of Botany, ANAS*

Influence of yellow rust disease on bread whaet cultivars (*Tricticum aestivum* L.) was studied in Absheron and Tartar Regional Experimental Stations. Leaf surface assimilation area, dry mass and intensity of photosynthesis decreased depending upon the disease severity and the vegetation development phases. Simultaneously, grain quality parameters and yield of studied cultivars declined.

***Key words**: Tricticum aestivum* L., *yellow rust, photosynthesis intensity, assimilation area, dry biomass, yield, race composition, resistance genes*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 104-109 (2014)*

# Preqravidar Hazırlıq Zamanı Böyrək Patologiyalı Xəstələrdə Anemiyanın Korreksiyası

**H.F.Bağırova, Ş.H.Qədimova**

*Azərbaycan Tibb Universitetinin II Mamalıq və Ginekologiya kafedrası, Bakıxanov küç., 21, Bakı AZ1022, Azərbaycan*

**Aparılan tədqiqatlar nəticəsində müəyyən olunmuşdur ki, anemiyanın inkişafında əsas patogenetik faktor eritropoetinin mütləq çatışmazlığıdır, hansı ki, xroniki böyrək xəstəliklərinin I dərəcəsində 46,6%, II dərəcəsində 58,1%, III dərəcəsində 61,7% müşahidə olunmuşdur. Hb-nin azalması zamanı eritropoetinin səviyyəsinin nisbi artımı xroniki böyrək xəstəliklərinin I dərəcəsində maksimal, xroniki böyrək xəstəliklərinin III dərəcəsində minimal olmuşdur. Böyrək patologiyası olan pasiyentlərin əksəriyyəti üçün normoxrom normositar anemiya xarakterik olmuşdur. Anemiyalı pasiyentlərin çoxunda iltihabyönlü sitokinlərin (Il-1β - 86,3%, Il-6 - 70,5% halda) zərdab konsentrasiyasının artımı qeyd olunmuşdur. Dəmir və rekombinat insan eritropoetini ilə kompleks müalicə anemiyalı pasiyentlərin 94,1% -ində Hb-nin əhəmiyyətli dərəcədə artımını əldə etməyə imkan vermiş və müalicə dövründə endogen eritropetinin səviyyəsi ilə Hb-nin artımı arasında mənfi əlaqə müəyyən olunmuşdur. Antianemik terapiya fonunda Il-1β və Il-6 sitokinlərinin zərdab qatılığının statistik əhəmiyyətli azalması müşahidə olunmuşdur.**

***Açar sözlər:*** *xroniki boyrək xəstəlikləri, böyrək patologiyası, hamiləlik, preqravidar hazırlıq, eritropoetin*

## GİRİŞ

Hamiləliyə hazırlıq *(pre- əvvəl, gravida – hamiləlik)* – uğurlu mayalanma, hamiləliyin rahat keçməsi və fəsadsız doğuşun zəruri şərtidir. Hamiləliyə hazırlığı nəzərdə tutulan hamilə qalma anından yarım il və ya daha yaxşı olar ki, bir il öncə başlamaq lazımdır. Hamiləlik zamanı həyati vacib orqanlar ikiqat yük ilə işləyir, onların bütün fəaliyyəti ana-cift-döl sisteminin qorunub saxlanmasına yönəldilir. Qadın üçün hamiləliyin planlaşdırılması təkcə reproduktiv sağlamlığın deyil, həm də ümumilikdə orqanizmin ikiqat yükə hazırlığının təminatını ehtimal edir (Бурлев, 2011; Бурлев идр., 2006; Сухих, 2009). Bu problem müasir mamalıq və perinatologiya baxımından xüsusilə aktualdır, çünki hamilə qadınlarda müxtəlif xəstəliklər daha çox hamiləlik zamanı təzahür edərək və ya ilk dəfə yaranaraq, hamiləliyin gedişini ağırlaşdırır və anada patologiya olduqda isə yenidoğulmuşların xəstələnmə riskini yüksəldir. (Коноводова, 2008).

Hamilələr arasında anemiyanın baş vermə tezliyi kifayət qədər yüksəkdir və 15-30% arasında dəyişir. Bir sıra müəlliflərin verdiyi məlumata görə, yaşayış yeri və sosial-iqtisadi vəziyyətindən asılı olaraq hamilələrin təxminən 56%-i anemiyadan əziyyət çəkir.

Böyrəklərin funksiyasının zəifləməsinin aşkar olunması anemiyanın müasir diaqnostikası və korreksiyası baxımından diqqət tələb edir [Сухих и Протопопова, 2009; Gambling et al., 2008]. Böyrək patologiyalı xəstələrdə anemiyanın əsas patogenetik inkişaf amili eritropoetinin (EPO) çatızmazlığıdır, EPO və dəmir defisiti olmadıqda isə anemiyanın inkişafında iltihabyönlü sitokinlərin hemopoezə təsiri aparıcı rol oynayır (Румянцев др., 2003; Хух и Брейман, 2007; Lozoff, 2007). Rekombinant insan eritropoetin (riEPO) prepa-ratları və onun törəmələrinin böyrək patologiyalı xəstələrdə anemiyanın korreksiyası üçün istifadəsinin effektivliyi və təhlükəsizliyi məsələlərinin öyrənildiyi kliniki tədqiqatlar onların tətbiqi ilə bağlı bir sıra sualların meydana çıxmasına səbəb olmuşdur (Румянцев др., 2003; Smiroldo et al., 2008).

Beləliklə, ağırlaşmış anemiyanın inkişafı ilə müşayiət olunan böyrək patologiyalı xəstələrə nəzarət məsələləri preqravidar hazırlığın həyata keçirilməsi zamanı olduqca aktualdır.

Tədqiqatın əsas məqsədi hamiləliyə preqravidar hazırlıq zamanı böyrək patologiyalı xəstələrdə anemiyanın korreksiyasının kliniki əhəmiyyəti və məqsədəuyğunluğunun əsaslandırılması olmuşdur.

## MATERİAL VƏ METODLAR

İşlənilib hazırlanmış klinik-laborator protakollar əsasında 2009-2013-ci illər ərzində ATU-nun II mamalıq və ginekologiya kafedrasının Ş.Ələsgərova adına 5 saylı doğum evinin bazasında müşahidə olunan 17 yaşından 39 yaşadək (orta yaş həddi 27,98±5,3) hamiləliyə preqravidar hazırlıq mərhələsində olan böyrək patologiyalı 26 qadın müayinə edilmişdir.

Xəstələrin şikayətləri, anamnezinin dəqiq öyrənilməsi, obyektiv müayinəsi aparılmışdır. Qanın kliniki analizində Hb-nin səviyyəsi, eritrositlərin sayı və retikulositlərin faizi, eritrositdə Hb-nin orta miqdarı (HOM), eritrositin orta həcmi (EOH), trombosit və leykositlərin sayı, eritrositlərin şökmə sürəti (EÇS) qiymətləndirilmişdir. Böyrəklərin funksional vəziyyətinin öyrənilməsi zamanı xəstələrdə mikroalbuminuriyanın olması qiymətləndirilmişdir. Müayinə "Immulite" immunohemilüminissent analizatorunda turbidimetrik metodla aparılmışdır. Həmçinin kreatinin, sidik cövhəri və elektrolitlərin qan zərdabında qatılığı təyin edilmişdir. 1 və 2-ci dərəcəli XBX (xroniki böyrək xəstəlikləri) müvafiq olaraq YFS (yumaqcıqların filtrasiya sürətinin) ≥90 və 60-89 ml/dəq/1,73 m2 göstəriciləri fonunda sidiklə yüksək albumin ekskresiyası zamanı diaqnozlaşdırılmışdır; 3-cü dərəcəli XBX albuminuriyanın səviyyəsindən asılı olmayaraq YFS<60 ml/dəq/1,73 m2 şəraitində diaqnozlaşdırılmışdır.

Anemiyanın patogenetik inkişaf amillərinin qiymətləndirilməsi üçün bütün xəstələrdə immunodiaqnostika metodları ilə EPO (referens göstəricilər 5-30 mMe/ml) və ferritinin (12-150 mkq/l) zərdab səviyyələri müəyyən edilmişdir.

Sistemli iltihabın qabarıqlığının öyrənilməsi üçün immunoferment analiz metodu ilə interleykin-1β (Il-1β) və interleykin-6 (Il-6) zərdab səviyyələri müəyyən edilmişdir. Referens göstəricilər müvafiq olaraq <50 pq/ml və <50 pq/ml təşkil etmişdir. Tədqiqatlar «Labsystems MR-600» analizatorunda aparılmışdır.

Antianemik terapiyanın effektliyinin tədqiqi üçün 110 q/l-dən aşağı Hb səviyyəsinə malik 26 böyrək patologiyalı xəstənin müalicəsi aparılmışdır. Anemiyanın nefrogen xarakteri yuxarıda təsvir olunmuş diaqnostik müayinələrlə təsdiq edilmişdir. Əsas qrupa dərialtı riEPO preparatı və peroral dəmir preparatları almış 18 xəstə daxil edilmişdir (onlardan 12-nə xroniki pielonefrit və 6-na xroniki qlomerulonefrit diaqnozu qoyulmuşdur). Əsas qrup xəstələri böyrəklərin xroniki xəstəliyinin (XBX) dərəcəsindən asılı olaraq 3 qrupa bölünmüşdür: 1-ci dərəcə - 5 xəstə, 2-ci dərəcə - 7 xəstə və 3-cü dərəcə - 6 xəstə. Müqayisə qrupunu peroral olaraq dəmir preparatı qəbul edən 8 xəstə təşkil etmişdir. Müalicə aparıldıqdan sonra 16 həftə ərzində əsas qrupda və müqayisə qrupunda qanın kliniki müayinəsinin göstəriciləri, böyrəklərin funksiyası, iltihabyönlü sitokinlərin səviyyəsinin dinamikası qiymətləndirilmişdir.

Tədqiqatın alınmış nəticələrinin statistik işlənməsi Microsoft Excel 2007 kompüter proqramı vasitəsilə aparılmışdır.

## NƏTICƏLƏR VƏ ONLARIN MÜZAKIRƏSI

Hər üç kliniki qrupda nəzarət qrupu ilə müqayisədə Hb-nin səviyyəsi və eritrositlərin sayında statistik əhəmiyyətli fərqlər qeydə alınmışdır. Retikulositlərin faiz miqdarı, bir qayda olaraq, cüzi artmışdır (1,2-1,5%), bu göstərici üzrə qruplar arasında əhəmiyyətli fərqlər müşahidə olunmamışdır. Bütün qruplarda orta EOH və HOM göstəriciləri norma daxilində olmuşdur. Eritrositlərin normositozu anemiyalı xəstələrin 71,0%, mikrositozu 15,0%, makrositozu 14,0%-də aşkar olunmuşdur. Normoxromiya 61%, hipoxromiya 27,0%, hiperxromiya 12,0% xəstələrdə müşahidə olunmuşdur. Leykosit və trombositlərin miqdarının orta göstəriciləri norma daxilində olmuş, lakin 3-cü qrupda trombositlərin sayı nəzarət qrupunda olduğundan xeyli aşağı olmuşdur. Həmçinin 3-cü qrupda nəzarət qrupu ilə müqayisədə EÇS-in daha yüksək göstəriciləri müşahidə olunmuşdur (Cədvəl 1).

Beləliklə, 3-cü dərəcə XBX olan xəstələr üçün daha qabarıq hematoloji pozulmaların mövcudluğu səciyyəvi olmuşdur. Müşahidə olunan bütün xəstələrdə YFS<60 ml/dəq/1,73$m^2$ azalma və/və ya sidiklə zülalın ekskresiyasının artması (mikroalbuminuriya, proteinuriya) şəklində böyrəklərin zədələnməsi əlamətləri olmuşdur.

1-ci qrupda kreatinin (62,9±2,3 mkmol/l) və sidik cövhərinin (6,0±0,7 mmol/l) orta zərdab konsentrasiyaları, eləcə də YFS norma daxilində olmuşdur. 2-ci qrupda kreatinin orta zərdab qatılığı norma daxilində (82,1±3,6 mkmol/l), sidik cövhəri isə normanın yuxarı həddində (9,4±1,1 mmol/l)

**Cədvəl 1.** Kliniki qruplarda əsas hematoloji göstəricilər

| Göstərici | Əsas qrup (n=18) | | | Nəzarət qrupu (n=8) |
|---|---|---|---|---|
| | 1-ci qrup (n=5) | 2-ci qrup (n=7) | 3-cü qrup (n=6) | |
| Hb, q/l | 110,8±3,0 * | 107,8±4,2 * | 105,7±3,5 * | 135,8±4,1 |
| Eritrositlər $10^{12}$/l | 3,88±0,23 * | 3,64±0,30 * | 3,65±0,19 * | 4,55±0,19 |
| Retikulositlər, % | 1,5±0,3 | 1,2±0,2 | 1,2±0,3 | 1,0±0,2 |
| HOM, пг | 30,1±1,3 | 29,4±1,2 | 28,6±0,9 | 29,7±0,8 |
| HOH, фл | 88,6±2,5 | 92,0±7,3 | 89,3±3,8 | 84,0±7,5 |
| Trombositlər, $10^9$/л | 276,4±35,6 | 314,4±33,0 | 217,4±19,6* | 330,8±42,4 |
| EÇS, mm/saat | 23,7±4,4 | 26,4±2,8 | 31,3±3,5 * | 18,5±4,3 |

**Qeyd:** * p<0,05 nəzarət qrupu ilə müqayisədə




**Şəkil 1.** XBX-nin müxtəlif mərhələlərində anemiyalı xəstələrdə EPO defisiti və hipoferritinemiya. Şərti işarələr: sıra 1 – EPO defisitinin tezliyi, %; sıra 2 – hipoferritinemiyanın tezliyi, %

olmuşdur. 3-cü qrupda hər iki göstərici yüksək olmuşdur. Elektrolit qatılıqlarında qruplararası fərqlər aşkarlanmamışdır.

YFS-in orta hesablama göstəriciləri: 1-ci qrupda - 106,4±6,9 ml/dəq/1,73 $m^2$, 2-ci qrupda - 72,1±3,3 ml/dəq/1,73 $m^2$, 3-cü qrupda 40,1±3,5 ml/dəq/1,73 $m^2$, nəzarət qrupunda - 75,6±12,4 ml/dəq/1,73 $m^2$ təşkil etmişdir. Nəzarət qrupunda orta YFS bütün anemiyalı xəstələrin analoji orta göstəricisindən əhəmiyyətli fərqlənməmişdir. Anemiyalı xəstələrdə nəzarət qrupu xəstələri ilə müqayisədə sidiklə zülal itkisinin daha yüksək göstəriciləri müşahidə olunmuşdur (müvafiq olaraq 0,39±0,10 q/l və 0,16±0,06 q/l). Proteinuriyanın aşkarlanma tezliyi müvafiq olaraq 40,0% və 16,0%, mikroalbuminuri-yanın - 52,0 % və 53,0 %, normoalbuminuriyanın - 8,0% və 31,0% təşkil etmişdir.

1-ci qrup (6,56±2,11 mME/ml) və 2-ci qrupa daxil olan (5,56±1,30 mME/ml) xəstələrdə EPO zərdab konsentrasiyasının orta göstəriciləri normanın aşağı həddində olmuşdur (5-30 mME/ml). 3-cü qrupa daxil olan xəstələrdə EPO-nun orta səviyyəsi (3,70±1,61 mME/ml) normal göstəricilərdən aşağı olmuşdur. Bu göstərici üzrə kontrol qrupla statistik əhəmiyyətli fərqlər müşahidə olunmamışdır. Xəstələrdə anemiyanın olmasını nəzərə alaraq, alınmış orta konsentrasiyaları 1 və 2-ci qruplarda nisbi EPO çatışmazlığı və 3-cü qrupda mütləq EPO defisiti kimi qiymətləndirmək olar. Ferritinin orta zərdab səviyyələri 1-ci (94,0±42,2 mkq/l) və 2-ci qrupda (116,2±18,7 mkq/l) normal göstəricilər çərçivəsində olmuşdur. 3-cü qrupda ferritinin orta səviyyəsi (226,8±35,4 mkq/l) normanı və nəzarət qrupunun müvafiq göstəricisini aşmışdır (124,5±27,1 mkq/l).

EPO çatışmazlığı bütün klinik qruplarda yayılmış hal olmuşdur. YFS azaldıqca EPO çatışmazlığının tezliyinin artım meyli müşahidə olunmuşdur. Hipoferritinemiya isə əksinə, nisbətən daha az aşkarlanmış və böyrəklərin filtrasiya funksiyaları pozulmamış xəstələrdə daha çox yayılmışdır (şəkil 1).

Hb-nin azalmasına müxtəlif dərəcəli XBX olan qadınlarda EPO-nun zərdab konsentrasiyasının qeyri-bərabər nisbi artımı müvafiq olmuşdur.

Beləliklə, 3-cü dərəcə XBX olan qadınlarda EPO-nun zərdab göstəricisi, bir qayda olaraq Hb-nin səviyyəsi aşağı olmuşdur.

Müşahidə altında olan böyrək patologiyalı xəstələrin əksəriyyətində bir və ya bir neçə iltihabyönlü sitokinin zərdab səviyyəsinin artması aşkarlanmışdır. Anemiyalı və normal Hb göstəricisinə malik xəstələrdə bu maddələrin zərdab konsentrasiyalarının artım tezliyi müvafiq olaraq: Il-1β üçün — 86,3% və 81,3 % ($\chi^2$=0,372; p>0,05), Il-6 üçün — 70,5 % və 34,4 % ($\chi^2$=9,82; p=0,002) təşkil etmişdir. Anemiyalı xəstələr üçün Hb-nin səviyyəsi normal olan xəstələrə nisbətən iltihabyönlü sitokinlərinin daha yüksək zərdab konsentrasiyaları xarakterik olmuşdur. Orta göstəricilər müvafiq olaraq: Il-1β — 328,2±75,5 pq/ml və 99,0±15,2 pq/ml (t=2,17; p=0,032), Il -6 — 44,1±7,0 pq/ml və 19,5±6,6 pq/ml (t=2,23; p=0,028) təşkil etmişdir.

Dərialtı riEPO yeridilməsi və peroral dəmir preparatları qəbulundan ibarət antianemik terapiya fonunda əsas qrupda Hb-nin səviyyəsinin statistik əhəmiyyətli yüksəlməsi - 97,1±2,0 q/l-dən 117,0±1,3 q/l-dək qeyd olunmuşdur (W=3,63; p<0,001 əlaqəli seçmələr üçün Vilkokson meyarı). Antianemik terapiyaya başlamazdan əvvəl müqayisə qrupunda Hb-nin orta konsentrasiyası 96,7±2,6 q/l təşkil etmiş, müalicə fonunda əldə olunmuş Hb-nin səviyyəsi (105,7±1,7 q/l) əsas qrupun analoji göstəricisi ilə müqayisədə aşağı olmuşdur (W=36,0; p<0,001). Hb-nin nəzərə çarpacaq qədər artımı (110-120 q/l) əsas qrupda xəstələrin 94,1%-i və müqayisə qrupunda xəstələrin 31,6%-də əldə olunmuşdur ($\chi^2$=14,8; p<0,001).

**Cədvəl 2.** Antianemik terapiya fonunda böyrəyin funksional göstəricilərinin dinamikası

| Göstərici | Əsas qrup | | Müqayisə qrupu | |
|---|---|---|---|---|
| | **Müalicədən əvvəl** | **Müalicədən sonra** | **Müalicədən əvvəl** | **Müalicədən sonra** |
| Sidiklə zülal itkisi, q/l | 0,50±0,09 | 0,29±0,05 * | 0,48±0,10 | 0,50±0,11 |
| Qan zərdabı kreatinin, mlmol/l | 118,7±10,1 | 120,6±9,1 | 115,4±8,8 | 116,0±8,6 |
| Qan zərdabının sidik cövhəri, mmol/l | 11,2±0,9 | 11,4±0,7 | 10,7±0,6 | 10,7±0,6 |

**Qeyd:** * p<0,05 müalicədən əvvəlki göstəricilərlə müqayisədə




**Şəkil 2.** Antianemik terapiya fonunda Il-1β və Il-6 zərdab səviyyələrinin dinamikası (pq/ml)
Şərti işarələr: Sıra 1 – müalicədən əvvəl; sıra 2 – müalicədən sonra

Nəzərə çarpacaq artım əsas qrupda xəstələrin 35,3%-də müşahidə olunmuş və müqayisə qrupunda qeydə alınmamışdır. Əsas qrup və müqayisə qrupunda HOM, EOH göstəricilərinin, trombositlərin, leykositlərin sayı və EÇS-in statistik əhəmiyyətli dəyişiklikləri müşahidə olunmamışdır. Bütün müalicə kursu ərzində Hb-nin artım kəmiyyəti endogen EPO-nun ilkin səviyyəsindən asılı olaraq əhəmiyyətli dərəcədə dəyişmişdir. ЭПО>5 mME/ml qatılıq şəraitində orta hesabla 6,4%, 2-dən 5-dək mME/ml şəraitində 17,1 %, <2 mME/ml-35,9 % təşkil etmişdir.

Əsas qrupda kompleks antianemik terapiya fonunda zülalın sidiklə ekskresiyası göstəricisinin statistik əhəmiyyətli azalması müşahidə olunmuşdur. Əsas qrupda və müqayisə qrupunda böyrəyin funksiyasını əks etdirən digər göstəricilərin nəzərəçarpan dinamikası qeydə alınmamışdır (cədvəl 2).

Antianemik terapiya kursundan sonra əsas qrupda Il-1β (W=3,52; p<0,001) və Il-6 (W=3,40; p<0,001) zərdab səviyyələrinin statistik əhəmiyyətli azalması müşahidə olunmuşdur. Müqayisə qrupunda müalicə fonunda iltihabyönlü sitokinlərin konsentrasiyası cüzi dəyişmişdir. Il-1β və Il-6 zərdab səviyyələrinin dinamikası şəkil 2-də verilmişdir.

Beləliklə, böyrək patologiyalı bütün xəstələrdə anemiyanın vaxtında diaqnostikası üçün XBX-nin mərhələsindən asılı olaraq ən azı 3-12 aydan bir qırmızı qan göstəriciləri qiymətləndirilməlidir. XBX olan qadınların müşahidəsi zamanı riEPO preparatlarından istifadə etməklə anemiyanın erkən korreksiyası həyata keçirilməlidir.

## NƏTICƏLƏR

- Böyrək patologiyalı xəstələrin əksəriyyəti üçün normoxrom normositar anemiya səciyyəvi olmuşdur. Normal HOM və HOH göstərici-lərindən kənarlaşmalar müvafiq olaraq xəstələrin 39% və 29%-də qeydə alınmışdır;
- Anemiyanın əsas patogenetik inkişaf amili 1-ci dərəcə XBX olan qadınların 46,6%-də, 2-ci dərəcə XBX olan qadınların 58,1%-də, 3-cü dərəcə XBX olan qadınların 61,7%-də müşahidə olunan mütləq EPO çatışmazlığı olmuşdur. Hb-nin azalması fonunda EPO səviyyəsinin nisbi artımı 1-ci dərəcə XBX olan qadınlarda maksimal və 3-cü dərəcə XBX olan qadınlarda minimal olmuşdur;
- Anemiyalı xəstələrin əksəriyyətində iltihabyönlü sitokinlərinin zərdab konsentrasiyalarının artması qeydə alınmışdır (Il-1β - 86,3%, Il-6 - 70,5% hallarda);
- riEPO və dəmir preparatları ilə kompleks müalicə anemiyalı xəstələrin 94,1%-də göstəricilərin əhəmiyyətli artımına nail olmağa imkan vermiş və müalicə müddətində endogen EPO səviyyəsi və Hb-nin yüksəlmə faizi arasında mənfi əlaqə aşkarlanmışdır. Antianemik terapiya fonunda Il-1β və Il-6 zərdab səviyyələrinin statistika əhəmiyyətli azalması müşahidə olunmuşdur.

## ƏDƏBIYYAT

**Бурлев В.А.** (2011) Воспалительный стресс: системный ангиогенез, белки острой фазы и продукты деструкции тканей у больных хроническим рецидивирующим сальпин- гоофоритом. Проблемы репродукции, **5:** 25–32.

**Бурлев В.А., Коноводова Е.Н., Орджоникидзе Н.В., Серов В.Н., Елохина Т. Б., Ильясова Н. А.** (2006) Лечение беременных с латентным дефицитом железа. Российский вестник акушера-гинеколога, **1:** 64–8.

**Коноводова Е.Н.** (2008) Железодефицитные состояния у беременных и родильниц (патогенез, диагностика, профилактика, лечение). Автореф. дис. д-ра мед. наук. М.: 46 с.

**Румянцев А.Г., Морщакова Е.Ф., Павлов А.Д.** (2003) Эритропоэтин в диагностике, профилактике и лечении анемий. М.: 447 с.

**Сухих Г.Т.** (2009) Беременность и роды при заболеваниях мочевыводящих органов. М, 432 с.

**Сухих Г.Т., Протопопова Т.Т.** (2009) Железодефицитные состояния у беременных и родильниц: Учебное пособие. М, 80 с.

**Хух Р., Брейман К**. (2007) Анемия во время беременности и в послеродовом периоде. М.: “Триада-Х”: 73 с.

**Gambling L., Andersen H., McArdle H.** (2008) Iron and copper, and their interactions during development. *Biochem.* Soc. Trans, **36 (6):** 1258–61.

**Lozoff B.** (2007) Iron deficiency and child development. Food Nutr. Bull., **28 (4):** 560–71.

**Smiroldo S., Sacco S., Columbo F. et al.** (2008) The role of infections in preterm labour. Book of abstracts 13th World Congress of Gynecological Endocrinology, Florence. Gynecol. Endocrinol., **24 (1):**1-158.

### Коррекция Анемии у Пациенток с Почечной Патологией при Прегравидарной Подготовке

**Х.Ф. Багирова, Ш.Г. Кадимова**

*Кафедра акушерства и гинекологии II Азербайджанского медицинского университета*

Проведенными исследованиями показано, что основным патогенетическим фактором развития анемии был абсолютный дефицит эритропоэтина, который наблюдался у 46,6% больных с хронической болезнью почек 1-ой стадии, у 58,1% - с хронической болезнью почек 2-ой стадии, у 61,7% - с хронической болезнью почек 3-ей стадии. Относительный прирост уровня ЭПО при снижении Hb был максимальным у пациентов с хронической болезнью почек 1-ой стадии и минимальным у пациентов с хронической болезнью почек 3-ей стадии. Для большинства пациентов с почечной патологией была характерна нормохромная нормоцитарная анемия. У большинства пациентов с анемией отмечалось повышение сывороточных концентраций провоспалительных цитокинов (Il-1β - в 86,3%, Il-6 - в 70,5% случаев). Комплексное лечение препаратами рекомбинантного человеческого эритропоэтина и железа позволило достичь целевых значений Hb у 94,1% пациентов с анемией, при этом выявлялась отрицательная связь между уровнем эндогенного эритропоэтина и процентом прироста Hb за период лечения. На фоне антианемической терапии наблюдалось статистически значимое снижение сывороточных концентраций Il-1β и Il-6.

***Ключевые слова:*** *хронические болезни почек, почечная патология, беременность, прегравидарная подготовка, эритропоэтин*

## Correction of Anemia in Patients With Renal Pathology in Pregravidal Preparing

**H.F. Baghirova, S.H. Gadimova**

*II Department of Obstetrics and Gynecology, Azerbaijan Medical University*

The studies have shown that the major pathogenetic factor in the development of anemia was an absolute deficiency of erythropoietin, which was observed in 46.6% of patients with chronic kidney disease stage 1, 58.1% - with chronic kidney disease stage 2 and 61.7% - with chronic kidney disease stage 3. Relative increase in the level of EPO at reduced Hb was greatest in patients with chronic kidney disease stage 1 and the lowest in patients with chronic kidney disease stage 3. Normochromic normocytic anemia was characteristic for most patients with renal disease. Increased serum concentrations of pro-inflammatory cytokines were observed in the majority of patients with anemia (Il-1β - in 86.3%, Il- 6 – in 70.5 % of cases). Comprehensive treatment with recombinant human erythropoietin and iron allowed to reach the target Hb values in 94.1 % of patients with anemia , while a negative association was detected between the level of endogenous erythropoietin and Hb percentage growth during the treatment period. Antianemic therapy led to a statistically significant decrease in serum concentrations of Il-1β and Il- 6 cytokines.

***Key words:*** *chronic kidney disease, renal disease, pregnancy, pregravid preparation, erythropoietin*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 110-114 (2014)*

# Frequency of Occurrence Met235thr Human Angiotensinogene Mutant Variant in Patients with Cardiovascular Diseases

**R.G. Kuliyeva, К.А. Aliyeva**

*Baku State University, 23 Z.Khalilov str., Baku AZ1148, Azerbaijan*

**Polymorphism of mutant variant of 235 (C-T) AGT gene was studied by means of complex of modern molecular-genetic methods of diagnosis for the first time in patients with cardio-vascular diseases. The mutation of 235 (C-T) in AGT gene was identified as 37.5% frequency of occurrence. Homozygous mutation type (T/T) was found in patients with severe arterial hypertension, while heterozygous mutation type (T/C) – in patients with severe as well as moderate arterial hypertension. Results of molecular- genetic investigations are of great practical importance. Timely revealing AGT mutation in gene 235 (C-T) will allow doctors to carry out prophylaxis in population with following qualified treatment of arterial hypertension.**

***Key words***: *genetic polymorphism, angiotensinogen, PCR, ischemic heart disease*

## INTRODUCTION

Gene of angiotensin (AGT) encodes angiotensinogen protein which takes part in blood pressure and electrolytes balance control. When blood pressure lowers, angiotensinogen turns into angiotensin 1 under rennin effect, which in its turn becomes angiotensin 2 and raises the blood pressure, lessening the vessels diameter and increasing water and salts resorption (Kim et al., 2010). 15 point mutations, most of which lead to amino acids substitutions, were identified in the course of angiotensinogen gene study (Kurland et al., 2004). Much work was devoted to analysis of relations between these mutations and cardio-vascular diseases. Most attentively there were researched variants related to amino acidic substitutions as 235 (C-T) (Мет 235RThr) and 174 (C-T) (Thr174RMet). Substitution of thymine to cytosine in the position 235 of angiotensin gene (235 (C-T)) leads to methionine to threonine amino acid in-protein substitution. Analysis of 235 (C-T) angiotensinogen gene polymorphism sowed distinct correlation between 235 (C-T) polymorphism and various forms of hypertension, mainly, in European populations and in Japans. At the same time there observed the absence of the said association in Afro-Americans. It is also shown, that 235 (C-T) variant is an independent risk factor for myocardial infarct and ischemic heart disease development in Europeans, while in Japans there was identified no association of the given polymorphism with ischemic heart disease. Hence, the 235 (C-T) variant brings the certain pathogenic effect, but it couldn’t be considered as a significant mutation, because its effect differs greatly in various ethnic groups’ representatives (Gu et al., 2008). Effect of ethno-polymorphic variant can define non-equal link with some pathogenesis variants of angiotensinogen gene or, on the other hand, it can manifest itself on specific population genetic background only. Frequency of mutant gene variant is in range of 34-43%.Mutation inheritance type: autosome dominant (encounted in men and women equally, it is enough to inherit one mutant gene variant from any of parents, and at even chance children will get the disease). Indication to prescription to carry out the analysis is arterial hypertension and other cardio-vascular disease in the anamnesis of the patient or his close relatives, preparation to pregnancy, and to anti-hypertensive medications prescription (Пальцев, 2011; Нгуен, Шкурат, 2010; Liljedahi et al., 2003; Ash et al., 2010).

The goal of our researches is the study of 235 (C-T) gene of AGT and identification of frequency of the given polymorphism in patients with cardio-vascular diseases by means of molecular-genetic diagnosis methods.

The goal of our studies is the identification of angiotensinogen gene polymorphism 235 (C-T) presence with assessment of mutation phenotypic and gene frequencies in patients with cardiovascular diseases, taking into consideration blind spot in the studies related to 235 (C-T) polymorphism of angiotensinogen presence in population of the Republic.

## MATERIALS AND METHODS

Material for the researches was 2ml of venous blood on EDTA (or heparin) anticoagulant from 24 people (13 men and 11 women) of 18 to 67 years of age with cardiovascular system disease.

Genomic DNA was isolated from venous blood using ready QIA ampgenomic DNA and RNA kits, manufactured by QIAGEN, Germany (Applicationinformation, 2000).

Isolation process was as follows: By means of automatic pipette volume 20µl we add an enzyme of QIAGEN Protease (or proteinase K) to Eppendorf tube of 1.5 ml. On top of that we add 200 µl of whole venous blood and 200 µl of AL buffer form QIAampgenomicDNAandRNA kits of QIAGEN Company. Mixture was stirred in a special device as pulse-vortex during 15 seconds. Then the tube was placed into thermostat at $56^0$C for 10 minutes. After incubation is completed, 200 µl of ethanol (96-100%) was added into the content of the tube and stirred one more time in the pulse-vortex device during 15 seconds. After stirring the content of the tube was replaced into special micro-columns (QIAmpMinispincolumn) with toss-away tubes. Then the content of the micro-columns were centrifuged at 6000xg (8000 x rpm) during 1 minute at room temperature. The content of the tube after centrifuging was discarded, and micro-column with fixed genomic DNA was replaced into another tube-storage of 2ml volume. 500µl of AW1 buffer were added to column and centrifuged again at 6000xg (8000 x rpm) during 1 minute at room temperature. The content of the tube was discarded after centrifuging, and micro-column with fixed genomic DNA in it was also replaced into another tube-storage of 2ml of volume. Hence, 500µl of AW2 buffer were added and anew centrifuged, but in another regime: 20.000xg (14.000 x rpm) during 3 minutes at the room temperature. After substitution of a tube-storage the column was centrifuged again in the same regime during 1 minute. After complete remove of buffer AW2 from the column, the same column was placed into a regular tube with a cap for centrifuging and added 200µl of AE buffer from the kit or distilled water, specially prepared for molecular investigations, wait for a minute at room temperature (15-$20^0$C) and centrifuged also for a minute at 6000xg (8000 x rpm). After centrifuging the column was discarded, and the content of Eppendorf tube was used for the further investigations. Genomic DNA was stored in the fridge at -$20^0$C (Application information, 2000).

Intactness and amount of isolated genomic DNA as well as of the amplificate (gene fragment) after PCR were identified by electrophoresis in 1.7% agarose gel by means of electrophoretic device and power source (PowerPacBasicGelDocIMEZ) Imager, BioRad, USA. DNALadder 100 bp (Applicationinformation, 2000) was used as a marker for DNA synthesized fragments during electrophoresis.

Polymerase-chain reaction (PCR) was carried out in the following regime: 95oC for 2 minutes, (95oC for 30sec, 58oC for 30sec, 78oC for 2minutes for 25-30 cycles), 72oC for 10 minutes and pause at 4oC for 7 minutes in amplificator ProfessionalThermocycler manufactures by Biometra, Germany (3).

The quality of isolated genomic DNA from venous blood was checked in 1.7% agarose. 0,5xTAE buffer was used for electrophoresis. DNALadder 100bp was as a marker. Duration of electrophoresis is 30-45 minutes. After electrophoresis the agarose gel was placed into water solution of ethidium bromide for 5-10 minutes (10µl of ethidium bromide in 1 liter of distilled water). Then gel for genomic DNA development and taking photo was put into GelDoc™EZSystemInstallationGuide.

AGT gene was amplified when intact genomic DNA was isolated from blood. For that purpose two primers (Forward and Reverse) were used for each of five gene fragments. Five exons of AGT gene served as fragments for researches.




1 2 3 4 5

**Figure 1**. Electrophoregram of DNA size marker (band 1) and fragments of AGT gene after PCR (bands 2-5).

The structure of synthetic nucleotide primers which we used for PCR of five exons of AGT gene is presented in Table 1. Reagents for reaction mixture for PCR were added into eppendorf micro-tube in the following sequence: distilled water (used for molecular investigations) -30 µl, Buffer+$MgCl_2$ -8.2 µl, 2.5 µl of each primer (Forward and Reverse), dNTP - 1.25 µl,

Taq polymerase enzyme – 0.63 µl and genomic DNA - 5µl. After PCR quality and quantity of the amplificate were appraised by electrophoresis in 1.7% agarose. 0,5xTAE buffer was also used for electrophoresis of PCR products. DNA Ladder 100 bp was used as a marker. Duration of electrophoresis was 45-60 minutes. PCR fragments were stained with water solution of ethidium bromide. Staining duration was 5 minutes. PCR results were developed and shot in the device Gel Doc™ EZ System Installation Guide. Figure 1 presents an electrophoregram of DNA size marker shown as band 1 and fragments of AGT gene after PCR, which were isolated from patient's blood sample.

DNA fragments were purified after two consequent PCR using the following reagents: Agencourt AMPure XP и SPRI CleanSEQ Magnetic BEARDS, respectively. Nucleotide sequence of each of five fragments of AGT gene were identified by sequencing in GenomeLab CEQ and GeXP (Genetic Analysis Systems) manufactured by Beckman Coulter, USA.

## RESULTS AND DISCUSSION

24 patients: 13 men and 11 women with cardio-vascular diseases in the age of 18 to 67 were included into researches. Identified duration of arterial hypertension was from 2 to 26 years according to anamnesis. Inheritance by arterial hypertension was burdened in 18 out of 24 patients (75%).

When rating severity degree of arterial hypertension, mild form of arterial hypertension was found in 6 patients out of 24 (25%), 10 (41.67%) of them had moderate arterial hypertension, and 8 (33.33%) had severe form of hypertension. The majority had a stable course of arterial hypertension. In 3 (12.5%) patients the course of arterial hypertension was crisis-like, those crises occurred not sooner than 3-4 times a year.

As a result of sequencing of AGT gene fragments, the substitution of cytosine nucleotide for thymine nucleotide in position 235 of the second intron, that leads to the substitution of methionine amino acid to threonine. In three cases: in two men and one woman, the said mutation was in homozygous state (T/T), in the rest six cases mutation was in heterozygous state (C/T).

Researches results of genetic polymorphism of AGT gene 235 (C-T) with identified phenotypic, genotypic and gene T and T alleles are presented in the Table 2.

As you see in the table, phenotypes (T/T), (C/T) and (C/C) frequencies are 12.5%, 25.0% and 62.5%, respectively. Genotypes frequency was equal to T/T – 0.1250, C/T – 0.2500 and C/C – 0.6250.

Therefore, frequencies of T and C alleles are 0.2500 and 0.7500, respectively. Phenotype frequency of 235 (C-T) polymorphism of AGT gene in the whole (T/T and C/T) became to be 37.5% and was similar to results obtained when researching populations of different countries throughout the world (2, 7, 8).

When appraising results on 235 (C-T) mutation among patients with different severity degrees off arterial hypertension, we've got the following picture: 6 of 8 (75%) patients with severe form of arterial hypertension have manifested the given mutation. Three (50%) of six patients with severe arterial hypertension had homozygous mutation state (T/T), and the rest three (50%) had heterozygous mutation (C/T).

**Table 1.** Name and structure of synthetic primers for AGT gene

| N | Primer name | Nucleotide sequence of a primer |
|---|---|---|
| **1** | AGT F1 | 5′-TGC TTC TGT GTT TTC CCC AGT-3′ |
| **2** | AGT R1 | 5′-AGA GAC AAG ACC GAG AAG GAG C-3′ |
| **3** | AGT F2 | 5′-GGG CTA AAT GGT GAC AGG GA-3 |
| **4** | AGT R2 | 5′-CCA GAG CCA GCA GAG AGG TTT-3′ |
| **5** | AGT F3 | 5′-CCT CAT TCC TGC CCC TGT CT-3′ |
| **6** | AGT R3 | 5′-GCT CAG GTG TGT CTA CTC CCC A-3′ |
| **7** | AGT F4 | 5′-AGC ACA GAG GTC CTG AGC C-3′ |
| **8** | AGT R4 | 5′-CCA AAG TCC AGG AAA GCA C-3′ |
| **9** | AGT F5 | 5′-AGA TCA TAA GTC TTG GGC C-3′ |
| **10** | AGT R4 | 5′-GCA TAG GCC AGG TTT CCA C-3′ |

**Table 2.** Phenotypic, genotypic and gene frequencies of T and C alleles of AGT gene

| Phenotype frequency (in %) | | Genotype frequency (in unit fractions) | | Alleles frequency | |
|---|---|---|---|---|---|
| T/T | 12,5 | T/T | 0,1250 | T | 0,2500 |
| C/T | 25,0 | C/T | 0,2500 | C | 0,7500 |
| C/C | 62,5 | C/C | 0,6250 | | |

In three cases (30%) 235 (C-T) mutation was identified in patients group with moderate arterial hypertension. It should be mentioned that this mutation was absent in the group of patients with mild arterial hypertension.

Thus, we have researched 235 (C-T) polymorphism of AGT gene by means of complex of modern molecular genetics diagnostics methods for patients with cardio-vascular diseases. It has been identified the presence of the 235 (C-T) mutation of AGT gene with frequency of 37.5% for patients with cardio-vascular diseases. Homozygous mutation (T/T) has been found in patients with severe arterial hypertension. Heterozygous mutation (C/T) has been identified in people with severe arterial hypertension as well as in patients with moderate arterial hypertension. Consequently, the obtained molecular genetics researches' results in patients with cardio-vascular diseases have great practical importance. On-time revealing of 235 (C-T) mutation of AGT gene in patients will enable doctors to carry out prophylaxis with following professional treatment of arterial hypertension.

## CONCLUSIONS

1. 235 (C-T) mutation of AGT gene presence has been identified in patients with cardio-vascular diseases and it has frequency of 37.5%.
2. In patients with severe arterial hypertension homozygous form of 235 (C-T) mutation frequency of occurance is as high as 75%.
3. The presence of 235 (C-T) mutation of AGT gene in heterozygous state (C/T) has been found in patients with severe and moderate arterial hypertension, while the given mutation hasn't been revealed in group with mild form of disease.

## REFERENCES

**Пальцева М.** (2011) Введение в молекулярную диагностику (под ред. Акад. РАН и РАМН М.А.Пальцева**)** «Изд. Медицина», с. 503.

**Нгуен Т.Ч., Шкурат Т.П.** (2010) Исследование ассоциации T174M и M235T гена ангиотензиногена с ишемической болезнью сердца в Ростовской популяции. Эпидемиология Апрель, с.63-75.

**Ash G., Scott R., Deason M., Dawson T., Wolde B., Bekele Z., Teka S., Pitsiladis Y.** (2010) No Association between ACE Gene Variation and Endurance Athlete Status in Ethiopians. Med Sci Sports Exerc.

**Gu W., Zhang F., Lupski J.** (2008) Mechanisms for human genomic rearrangements, Eur. J. Hum. Genet. **1:** 4-12.

**Kim S., Oh SD., Jung I., Lee J., Sim Y., Lee J., Kang B.** (2010) Distribution of the Trp64Arg polymorphism in the beta(3)-adrenergic receptor gene in athletes and its influence on cardiovascular function. Kardiol Pol., **68(8)**: 920-926.

**Kurland L., Liljedahi U., Karlsson J. et al.** (2004) Angiotensinogen gene polymorphism: relationship to blood pressure response to antihypertensive treatment. Results from the Swedish Irbesartan Left Ventricular Hypertrophy Investigation vs Atenolol (SILVHIA) trial. Am.J.Hypertrens, **1:** 8-13.

**Liljedahi U., Karlsson J., Melhus H. et al.** (2003) A microarray minisequencing system for pharmacogenetic profiling of antihypertensive drug response. Pharmacogenetics, **13(1):** 7-17.

### Ürək Qan-Damar Sistemi Xəstəliklərində Insanın Angiotenzinogen Geninin 235 (C-T) Mutant Variantının Rast Gəlmə Tezliyi

**R.Q. Quliyeva, K.Ə. Əliyeva**

*Bakı Dövlət Universiteti*

Müasir molekulyar-genetik metodlar kompleksindən istifadə edərək ürək qan-damar sisteminin xəstəliklərində insanın angiotenzin geninin 235 (C-T) polimorfizmi tədqiq edilmişdir. 235 (C-T) mutasiyası tezliyi tədqiq edilən qrupda 37,5% təşkil etmişdir. Mutasiyanın homoziqot forması (T/T) arterial hipertenziyanın ağır olan qrupunda aşkar edilmişdir. Beləki, mutasiyanın heteroziqot formasına (T/C) arterial hipertenziyanın ağır və orta ağırlıqda olan qruplarında təsadüf edilmişdir. Molekulyar genetik tədqiqatların nəticəsinə angiotenzinogen geninin aşkarlanmış mutasiyasına 235 (C-T) əsaslanaraq əhali arasında arterial hipertenziyanın profilaktikası və ixtisaslı müalicəsi aparılacaqdır.

***Açar sözlər***: *genetik polimorfizm, angiotenzinogen, PZR, ürəyin işemik xəstəliyi*

**Частота Встречаемости Мутантного Варианта 235 (C-T) Ангиотензиногена Человека У Больных Сердечно-Сосудистыми Заболеваниями**

**Р.Г.Кулиева, К.А.Алиева**

*Бакинский государственный университет*

У больных сердечно-сосудистыми заболеваниями изучен полиморфизм 235 (С-Т) гена АГТ с использованием комплекса современных молекулярно-генетических методов диагностики. Установлено наличие мутации 235 (С-Т) гена АГТ с частотой 37,5%. Гомозиготное состояние мутации (Т/Т) обнаружено у лиц с тяжелой формой артериальной гипертензии, тогда как гетерозиготное состояние мутации (Т/С) обнаружено у лиц с тяжелой и умеренной формой артериальной гипертензии. Полученные результаты молекулярно-генетических исследований имеют большое практическое значение. Своевременное выявление мутации 235 (С-Т) гена АГТ у населения позволит врачам проводить профилактику, а затем и квалифицированное лечение артериальной гипертензии.

***Ключевые слова****: генетический полиморфизм, ангиотензиноген, ПЦР, ишемическая болезнь сердца*

*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №1, səh. 115-121 (2014)*

# Yenidoğulan Körpələrdə İnterleykin-1 Geninin Polimorfizminin Perinatal İnfeksiyalarla Əlaqəsinin Öyrənilməsi

**N.C.Rəhimova**

*Azərbaycan Respublikası Səhiyyə Nəzirliyi K.Y.Fərəcova adına Elmi-Tədqiqat Pediatriya İnstitutu, Bəsti Bağırova 15, Bakı AZ1065, Azərbaycan; E-mail: rahimova_nailya@mail.ru*

**Tədqiqat işi yenidoğulan sağlam və xəstə körpələrdə interleykin-1 geninin müxtəlif pozisiyalarındakı polimorfizmlər ilə perinatal infeksiyalar arasında əlaqələrin mövcudluğunu araşdırmaq məqsədilə yerinə yetirilmişdir. Yenidoğulanlarda (78 körpə) IL-1β zülalının miqdarının etioloji amillərdən asılılığının öyrənilməsi göstərmişdir ki, sitomeqalovirus infeksiyası ilə müqayisədə bu zülalın ən yüksək qatılığı qarışıq və bakterial infeksiyalara yoluxma hallarında qeydə alınır. *IL-1* gen ailəsində tək nukleotid əvəzolunmaları ilə əlaqəli polimorfizmləri aşkar etmək məqsədilə *IL-1α, IL-1β* və *IL-1RA* tənzimləyici genlərinin, uyğun olaraq, -889 və +4845; -511, -31 və +3954, +2018 mövqelərində nukleotid ardıcıllıqları təyin olunmuşdur. Tədqiqat nəticəsində məlum olmuşdur ki, *IL-1* geninin promotor sahəsinin -511 mövqeyi istisna olmaqla, öyrənilən digər pozisiyalarının polimorfizmləri ilə perinatal infeksiyalar arasında statistik cəhətdən etibarlı asılılıq mövcud deyildir. *IL-1β* geninin promotor nahiyyəsinin - 511 mövqeyində isə C allelinin tezliyi xəstə körpələrdə sağlam körpələrdən əhəmiyyətli dərəcədə yüksək olmuşdur. Alınan nəticələrə əsaslanaraq güman etmək olar ki, *IL-1β* geninin promotor sahəsinin -511 mövqeyində tək nukleotid əvəzolunması ilə əlaqəli polimorfizmin mövcudluğu perinatal infeksiyaların formalaşması və inkişafına təsir göstərir, həmçinin infeksion xəstəliklərə yoluxma riskini dəfələrlə artırır.**

***Açar sözlər:*** *yenidoğulanlar, perinatal infeksiyalar, interleykin-1 geninin polimorfizmləri.*

## GİRİŞ

Ana və körpələrin xəstəliklərə yoluxması və ölümü ilə əlaqəli infeksion patologiya perinatalogiyanın aktual problemi olaraq qalmaqdadır (Долгих Т.И., 2012, Шабалов Н.Н., 2012). Son illərin tədqiqatları sitokinlərin bir çox yoluxucu xəstəliklərin qarşısının alınmasında mühüm rola malik olduğunu göstərmişdir (Гончарова И.А., 2006, Долгих Т.И., 2011, Simbirsev A.S., 2005). İnterleykin-1 sitokin qrupuna aid olub, monosit, makrofaq və epiteli hüceyrələrində mikrob həmləsi zamanı meydana çıxan iltihab proseslərində və immunitetin zəifləməsi hallarında fəaliyyətə başlayır. *IL-1α*, *IL-1β* və *IL-1RA* genləri interleykin-1 gen ailəsinə mənsub olub, eyni bir klaster daxilində, ikinci xromosom üzərində lokallaşmışlar. Bu gen klasterində yerləşən xüsusi lokuslar interleykin-1 zülalını kodlaşdırır. *IL-1* geninin daxilində və ətrafında çoxlu sayda tək nukleotid polimorfizmləri (SNP - single nucleotide polymorphism) aşkar edilmişdir. *IL-1RN* geninin ikinci intronunda 86 nukleotiddən ibarət, bir təkrarlı (VNTR-variabel number tandem repeat) universal allel mövcuddur. *IL-1β* geni +3954 mövqeyi və promortor sahəsinin -511, -31 pozisiyalarının tək nukleotid polimorfizmləri ilə seçilir. *IL-1α* geni isə +4845 və promotor sahəsinin -899 mövqelərinin tək nukleotid polimorfizmləri nəticəsində meydana çıxmış 4 fərqli allelin mövcudluğu ilə səciyyələnir. Bu polimorfizmlər *IL-1* zülalının ekspressiyasının tənzimlənməsində mühüm rol oynayır. Bu genlərin polimorf mövqelərinin bir çox xəstəliklər, o cümlədən yoluxucu, ürək-damar, tənəffüs və bəzi şiş xəstəlikləri ilə əlaqələndiyi aşkar edilmişdir (Мироненко М.М., 2011, Рабсон А., 2006, Hallman M., 2012). Bir sıra tədqiqatlar nəticəsində orqanizmin bəzi xəstəliklərə yoluxma intensivliyinin, onlara qarşı həssaslıq və davamlılığının *IL-1* geninin polimorf hissələri ilə əlaqələndiyi müəyyən edilmişdir ki, bu da öz növbəsində yenidoğulan körpələrdə infeksion xəstəliklərlə *IL-1* geninin tək nukleotid polimorfizmləri arasında əlaqələrin araşdırılmasına zəmin yaradır (Kang Y.A., 2009, Sata F. et al., 2009). İnsan genomunda tək nukleotid polimorfizminə (SNP) 1000 n.c.-dən (nukleotid cütü) birində rast gəlindiyindən, hər bir fərd digərindən 3 mln. n.c.-yə görə fərqlənə bilir. SNP-lərin çoxu genlərin kodlaşdırmayan sahələrində yayıldığından, funksional cəhətdən inertdir. Lakin onlardan bəziləri genlərin kodlaşdırıcı sahələrində yerləşərək, müxtəlif xəstəliklərin əmələ gəlmə təhlükəsini xeyli artıra bilir (Макконки Э., 2008).

İnterleykin-1 geninin insan orqanizmindəki mühüm rolunu nəzərə alaraq, bu gendə baş verən tək nukleotid əvəzolunmaları nəticəsində meydana çıxan polimorfizmlər ilə perinatal infeksiyalar arasında mövcud olan əlaqələrin aşkarlanması məq-

sədilə cari tədqiqat işində infeksiyalı yenidoğu lanlarda və sağlam körpələrdə interleykin-1 geninin polimorfizmləri öyrənilmişdir.

## MATERİAL VƏ METODLAR

Aparılan tədqiqatda 78 yenidoğulan körpə müayinəyə cəlb edilmiş, onlardan 63-ü müxtəlif mənşəli infeksion xəstəliklərə yoluxmuş, digər 15 nəfəri isə sağlam olmaqla, nəzarət (kontrol) qrupunu təşkil etmişdir. Alınan nəticələrə əsaslanaraq və hestasiya yaşını nəzərə alaraq, yenidoğulanlar müvafiq qruplara ayrılmışlar: I qrupu sitomeqalovirus infeksiyalı (SMVİ) 27 yenidoğulan, II qrupu qarışıq infeksiyalı (SMVİ+herpes virus, SMVİ+toksoplazmoz) 20 yenidoğulan təşkil etmişdir. III qrupa bakterial infeksiyalı 16 yenidoğulan daxil edilmişdir ki, onlardan 7-də sepsis, 9-da bakterial infeksiya mənşəli iltihab prosesi (pnevmoniya, omfalit, konyuktivit, piodermiya, otit) müəyyən edilmişdir.

Müayinəyə cəlb edilən xəstə körpələrin 37 nəfəri vaxtında doğulan, 26-sı isə vaxtından qabaq doğulan olmuşdur. Vaxtında doğulan körpələrin hestasiya yaşı 38,5±0,2 həftə, az bədən kütləli (AK) vaxtından qabaq doğulanlarda-33,6±0,3 həftə, çox az kütləli (ÇAK) yenidoğulanlarda - 29,6±0,4 həftə, ekstremal az kütləli yenidoğulanlarda (EAKY) - 26,3±0,5 həftə olmuşdur. Eyni zamanda vaxtında doğulan körpələrin bədən kütləsi 3135±107 q, AK vaxtından qabaq doğulanlarda 1948±42 q, ÇAK yenidoğulanlarda 1326±22 q, EAKY-da isə 800 ±69 q olmuşdur.

Müayinə olunan yenidoğulanlardan qan zərdabı nümunələri, 0,5-1 ml həcmdə olmaqla, həyatlarının 3-5-ci günlərində götürülmüş və -20ºC-də saxlanılmışdır. *IL-1β* zülalının miqdarının təyini üçün standart immunoferment analizi üsulundan və "Vektor–Best" (Novosibirsk istehsalı) test (analizator «Sirio» İtaliya) sistemlərindən istifadə olunmuşdur.

Cari tədqiqat işində eyni zamanda *IL-1* geninin polimorfizmləri ilə perinatal infeksiyalar arasındakı əlaqələrin öyrənilməsi məqsədilə yenidoğulan 50 xəstə və 76 sağlam körpə də müayinə edilmişdir. Hər bir körpədən 5 ml qan alınaraq, 5 ml 0.5 M EDTA (ethylendiaminetetraacetic acid –etilendiamintetraasetat turşusu) məhlulu (pH=8.0) ilə qarışdırılmış və -20°C-də saxlanılmışdır. DNT "Salting out" protokolu əsasında ekstraksiya olunmuş, miqdarı spektrofotometrdə OD 260/280 dalğa uzunluğunda yoxlanılmış və bütün nümunələrdə bu nisbətin qiyməti 1.7-1.9 arasında olmuşdur. Cari tədqiqatda *IL-1α* geninin +4845 mövqeyinin G/T və promotor nahiyyəsinin -889 mövqeyinin C/T, *IL-1β* geninin +3954 və promotor rayonunun -31, -511 mövqelərinin C/T və *IL-1RA* geninin +2018 mövqeyinin C/T polimorfizmi PZR (polimeraza zəncirvari reaksiyası) vasitəsilə öyrənilmişdir. PZR zamanı bir nümunə üçün tələb olunan 25 µl qarışıq 20-50 nq DNT, 1x PZR bufer, 0.2 mmol/l $MgCl_2$, 100 µmol/l hər bir dNTP-dən, 0.1 µmol/L praymer və 1 U *Taq-polimeraza*-dan ibarət olmuşdur. Amplifikator aparatında (Gene Amp 9700 Applied Biosystems thermocycler) polimeraza zəncirvari reaksiyasının tsiklləri aşağıdakı ardıcıllıqla yerinə yetirilmişdir: DNT 5 dəq. Müddətində 94°C temperaturda denaturasiya edilmiş, 3 mərhələdən - 30 san. 94°C, 30 san. 60°C və 1 dəq. 72°C – ibarət 45 tsikl ardıcıl icra olunmuş və reaksiya 7 dəq. müddətində 72°C temperaturda inkubasiya ilə tamamlanmışdır. PZR məhsulunun analizi məqsədilə 1.5%-li aqaroza gellərindən istifadə edilmişdir. Gellərin şəkilləri BioRad GelDoc aparatı vasitəsilə çəkilmişdir. İki qrupda: yenidoğulan xəstə və sağlam körpələrin populyasiyalarında *IL-1* geninin tədqiq olunan mövqeləri üzrə allel və genotip tezlikləri hesablanmışdır. İki qrupa məxsus genom fraqmentləri arasında müşahidə olunmuş fərqin statistik cəhətdən etibarlılığını təsdiqləmək məqsədilə SPSS-16 kompüter proqramından istifadə yolu ilə $\chi^2$ testi yerinə yetirilmişdir. Etibarlılığın 0.05-dən aşağı səviyyəsi müsbət nəticə kimi qiymətləndirilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Son illərdə aparılmış tədqiqatların nəticələri göstərmişdir ki, sitokinlərin müxtəlif polimorfizmləri bir çox xəstəliklərin, o cümlədən yoluxucu xəstəliklərin meydana çıxması ilə nəticələnir. Genlərin tənzimləyici və ya struktur sahələrində baş verən polimorfizmlər onların ekspressiya məhsullarının, hətta immunoloji reaksiyalara aid genlərin məhsulunun dəyişməsinə səbəb ola bilər.

Yenidoğulanlarda əsas kliniki sindromlar arasında nevroloji pozulmalar, tənəffüsün pozulması sindromu və sarılıq üstünlük təşkil edir.

Nəzarət qrupu ilə müqayisədə SMVİ-lı, vaxtında doğulan körpələrdə *IL-1β* zülalının miqdarı 2 dəfə, vaxtından qabaq doğulanlarda isə 1,4 dəfə yüksək olmuşdur. Qarışıq infeksiyalı, vaxtında doğulan və vaxtından qabaq doğulan körpələrdə *IL-1β* zülalının miqdarı nəzarət qrupu ilə müqayisədə 2,8 dəfə yüksək olmuşdur. Bakterial infeksiyalara yoluxmuş yenidoğulanlarda *IL-1β* zülalının miqdarı daha yüksək səviyyəyə çatmışdır (nəzarət qrupu ilə müqayisədə 4,7 və 3,2 dəfə artıq olmuşdur).

Beləliklə, müxtəlif infeksiyalı yenidoğulanlarda xəstəliyin etiologiyasından asılı olaraq, *IL-1β* zülalının miqdarının öyrənilməsi göstərmişdir ki, onun ən yüksək qatılığı monositomeqalovirus

